YENİ İLİNİZ MÜBARƏK!

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

Dekabr 2014
10 (1064)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Dünya azərbaycanlılarına



Əziz həmvətənlər!

Hörmətli soydaşlar!

Hər il böyük sevinclə qeyd etdiyimiz 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəylik Günü ərəfəsində Sizi ürəkdən salamlayır, hamınıza xoşbəxtlik, sülh və əmin-amanlıq arzulayıram!

Dünyada yaşayan soydaşlarımızın Vətənə və azərbaycançılıq məfkurəsinə sədaqətini, xalqımızın öz keçmişinə və milli-mənəvi dəyərlərinə ehtiramını əks etdirən bu bayram tarixi yaddaşımızın mühüm tərkib hissəsinə çevrilmişdir. Ümummilli lider Heydər Əliyevin misilsiz xidmətləri sayəsində milli birlik və həmrəylik ideyaları daha dolğun məzmun kəsb edərək, real fəaliyyət sahəsi kimi dövlət siyasəti səviyyəsinə yüksəlmişdir. "Güclü dövlət - güclü diaspor" prinsipini rəhbər tutan həmin siyasətin əsas qayəsi xarici ölkələrdə yaşayan soydaşlarımızın tarixi Vətənlə bağlılığını möhkəmləndirmək, mütəşəkkilliyini artırmaq, diaspor qurumlarının imkanlarından həmvətənlərimizin hüquqlarının və milli dövlət maraqlarının qorunmasında daha səmərəli istifadə etməkdən ibarətdir.

Sevindirici haldır ki, diaspor quruculuğu sahəsində aparılan işlər öz bəhrəsini verir. Xaricdəki həmvətənlərimiz məskunlaşdıqları ölkələrin cəmiyyətlərində mövqelərini genişləndirir, Azərbaycanın dünyada tanıdılmasına, zəngin mədəniyyətimizin təbliğinə, bəzi qüvvələrin dövlətimiz və xalqımızın əleyhinə yönəlmiş məkrli planlarına qarşı təsirli tədbirlər görürlər. Diaspor təşkilatlarımız bundan sonra da səylərini artırmalı, Azərbaycanın müvafiq dövlət qurumları və xarici ölkələrdəki diplomatik nümayəndəlikləri ilə əməkdaşlıq şəraitində daha məqsədyönlü və çevik fəaliyyət göstərməlidirlər.

Bu gün hər bir həmvətənimiz Azərbaycan Respublikası ilə fəxr etməkdə haqlıdır. Biz keçən illər ərzində iqtisadiyyatımızı sürətlə inkişaf etdirməyə, əhalinin rifah halını yüksəltməyə, yoxsulluq və işsizlik kimi sosial bəlaların səviyyəsini minimuma endirməyə nail olmuşuq. Enerji resurslarından əldə edilən gəlirlər iqtisadiyyatın şaxələndirilməsinə, insan kapitalının və demokratik institutların inkişafına yönəldilmişdir. Ölkədə nəhəng nəqliyyat və sosial infrastruktur layihələri icra edilmiş, elm, təhsil, səhiyyə, mədəniyyət və idmanın inkişafı üçün müasir və güclü maddi-texniki baza yaradılmışdır.

Sivilizasiyalararası dialoq və humanitar əməkdaşlıq istiqamətində irəli sürülən təşəbbüslər, yüksək səviyyədə keçirilən beynəlxalq forumlar ölkəmizi multikulturalizm və tolerantlığın mərkəzi kimi tanıtmışdır.

Azərbaycan müstəqil dövlət kimi dünyanın siyasi, iqtisadi və humanitar həyatında fəal rol oynayır. 2014-cü ildə Avropa Şurası Nazirlər Komitəsinə sədrliyi dövründə ölkəmiz üzərinə düşən vəzifələri layiqincə yerinə yetirmişdir.

Cari ildə "XXI əsrin müqaviləsi" adlandırılan layihənin icrası istiqamətində mühüm addım atılmışdır. "Cənub qaz dəhlizi"nin təməlinin qoyulması ilə Azərbaycan Avropanın enerji təhlükəsizliyi sistemində öz mövqelərini daha da möhkəmləndirmək və beynəlxalq aləmə inteqrasiyanı dərinləşdirmək üçün yeni imkanlar qazanmışdır.

Gələn ilin yayında paytaxtımız birinci Avropa Oyunlarına ev sahibliyi edəcəkdir. Biz bu böyük idman bayramına ciddi hazırlaşır, ölkəmizə bəslənilən inam və etimadı doğrultmaq üçün əzmlə çalışırıq.

Müstəqillik dövrünün qısa tarixi dövlətimizin strateji xəttinə alternativin olmadığını, azərbaycançılıq ideologiyasına söykənən siyasətin düzgünlüyünü sübut edir. Əminəm ki, dünya azərbaycanlılarının həmrəyliyi bundan sonra da xalqımızın qarşısında dayanan bütün vəzifələrin öhdəsindən uğurla gəlməyə, torpaqlarımızı tezliklə Ermənistanın işğalından azad etməyə, sürətlə dəyişən, ziddiyyətli dünyanın çağırışlarına adekvat cavab verməyə kömək edəcəkdir. Bunun üçün biz sıralarımızı daha da möhkəmləndirməli, əcdadlarımızdan miras qalmış çoxəsrlik mədəniyyətimizi inkişaf etdirməli və hamımızın pənah yeri olan müstəqil Azərbaycanımızın güclənməsinə birgə əməli fəaliyyətimizlə yeni töhfələr verməliyik.

Bu bayram münasibətilə Sizi səmimi qəlbdən təbrik edir, hər bir soydaşımıza və həmvətənimizə səadət, firavanlıq, işlərində uğurlar diləyirəm!

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 24 dekabr 2014-cü il.*

## Həyatın və zamanın fövqündə

### ADPU-da ulu öndər Heydər Əliyevi anım mərasimi keçirilib

Dekabr ayının 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) xalqımızın ümummilli lideri Heydər Əliyevi anım mərasimi keçirilib. Əvvəlcə universitetin professor-müəllim heyəti və tələbə kollektivi Fəxri Xiyabanda ulu öndər Heydər Əliyevin məzarını ziyarət edib, məzarı önünə əklil və gül dəstələri qoyub. Xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib. Sonra universitetin Böyük zalında Ulu Öndəri anım mərasimi keçirilib. Anım mərasimində ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirilib və ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.





ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov anım mərasimində məruzə ilə çıxış edərək bildirib ki, xalqımızın böyük oğlu, Türk dünyasının məşhur siyasət və dövlət xadimi, ulu öndərimiz Heydər Əliyevin vəfatından 11 il keçir. Təbii ki, biz bu gün ümummilli liderimiz Heydər Əliyevi anım mərasimində Ulu Öndərimizin haqq dünyasına qovuşduğu günü xatırlayırıq. 2003-cü il dekabr ayının 12-i sözün həqiqi mənasında xalqımız, millətimiz üçün çox ağır və kədərli bir gündür. Çünki xalqımız həmin gün öz böyük oğlunu, millətsevər rəhbərini itirib.

Rektor Y.Məmmədov qeyd edib ki, biz bu gün həyatımızın hansı sahəsinə diqqət yetirsək, xalqımızın bu böyük oğlunun fədakar əməyini, çoxcəhətli fəaliyyətini görürük. Ulu öndərimiz Heydər Əliyev son 35-40 ildə dövlətimizin hərtərəfli inkişafında və dünya miqyasında tanınmasında əvəzsiz xidmətlər göstərmiş böyük tarixi şəxsiyyətdir. Dahi öndər Heydər Əliyev hələ Sovetlər Birliyi dövründə Azərbaycana rəhbər seçilərkən ölkəmizi tənəzzüldən xilas etmiş, onu inkişaf yoluna çıxarmışdır. Belə ki, 1969-cu ilin iyul ayının 14-də Heydər Əliyevin Azərbaycana rəhbər seçilməsi ilə Azərbaycan cəmiyyətinin mövcudluğunun, fəaliyyətinin, bütövlükdə həyatının ideya-konseptual prinsiplərinin təməli qoyuldu. İqtisadi və mənəvi tənəzzül dövrünü yaşayan Azərbaycanın tərəqqiyə dönüşü, cəmiyyətin keyfiyyətcə irəliyə, milli özünüdərkə, milli özünəqayıdışa dönüşünün başlanğıcı oldu. Heydər Əliyevin hakimiyyətə gəlişi ilə qısa müddətdə cəmiyyət həyatının bütün sahələrinin sürətli yüksəlişi, istehsalın, elmin, mədəniyyətin, mənəviyyatın tərəqqisi, əslində, daha böyük nailiyyətlərə, milli ruhun inkişafına, milli özünüdərkin və milli qürurun yüksəlməsinə səbəb oldu. Bunlar isə gələcəkdə müstəqil Azərbaycan dövlətinin yaranmasına xidmət edən əzəmətli planın tərkib hissəsini təşkil etdi.

Ümummilli lider Heydər Əliyev XX əsrin sonu və XXI əsrin əvvəllərində böyük siyasi məharətlə Azərbaycanı, dövlətçiliyimizi, müstəqilliyimizi hədələyən bütün bəlaları dəf etmiş, iqtisadiyyatımızın, beynəlxalq əlaqələrimizin, milli birliyimizin möhkəm özülünü quraraq bizlərə əmanət etmişdir.

Xalqımızın ümummilli lideri Heydər Əliyev həmişə elmə, təhsilə böyük qayğı və diqqət göstərmişdir. Heç də təsadüfi deyildir ki, Ümummilli Liderin Azərbaycana rəhbərlik etdiyi illər elm və təhsil sahəsində intibahın yeni dövrü kimi səciyyələndirilir. Müxtəlif ali təhsil müəssisələrinin yaranması, xalqın ali təhsilə cəlb olunınası, elmi-tədqiqat institutlarının yaradılması, tədqiqat işlərinin genişlənınəsi və AMEA-nın gərgin axtarışlarla zəngin fəaliyyəti məhz bu illərə təsadüf edir. Azərbaycanda təhsil sisteminin, o cümlədən ali təhsil müəssisələrinin formalaşmasında, dövrün tələblərinə uyğun yenidən qurulmasında, sürətlə inkişafında, milli kadrların hərtərəfli hazırlanmasında bu böyük şəxsiyyətin əvəzsiz xidmətləri vardır. Məhz bu illərdə təhsil ölkəmizin iqtisadiyyatının, elm və mədəniyyətinin, sosial sahələrinin yüksəlməsinə təkan verən daha güclü qüvvəyə çevrildi, vətəndaşların təhsil almaq imkanlarının artırılması istiqamətində təsirli tədbirlər həyata keçirildi. Azərbaycana rəhbərliyinin birinci dövründə (1969-1982) Heydər Əliyevin daimi diqqət və qayğısı sayəsində respublikamızda məktəbəqədər tərbiyə müəssisələrindən tutmuş, ali məktəblərə qədər bütün təhsil müəssisələrinin şəbəkəsi ilbəil genişləndi, təhsil sisteminin maddi-texniki bazası ardıcıl surətdə möhkəmləndirildi. Bütün bunlar Heydər Əliyevin şəxsi təşəbbüslərinin nəticəsi idi. Ulu Öndər haqlı olaraq qeyd edirdi ki, savadı, təhsili olmayan gənc həyatda layiqli yer tuta bilməz. O, 1997-ci ildə respublikamızın və xarici ölkələrin ali məktəblərinə qəbul olunınuş tələbələrin bir qrupu ilə görüşündəki nitqində deyirdi ki, müasir həyat və dünyanın gələcəyi insanlardan daha çox bilik tələb edir, çünki gələcək bilikli, elmli insanların çiyinləri üzərində qurulacaqdır.

Heydər Əliyevin Azərbaycanda təhsilin, maarifm inkişafına qayğısı onun SSRİ hökumətinin rəhbərliyində olduğu illərdə də zəifləməmiş, əksinə, daha da artmışdır. Yüksək ziyalılığı, intellekt səviyyəsi, maarifə hədsiz məhəbbəti ilə həmişə fərqlənən müdrik öndərimiz SSRİ Nazirlər Soveti Sədrinin I müavini vəzifəsində çalışarkən (1982-1987) keçmiş Sovet İttifaqında həm də təhsil sahəsinə ümumi rəhbərliyi həyata keçirmişdir. 1983-1984-cü illərdə SSRİ-də məktəb islahatının Heydər Əliyevin rəhbərliyi altında aparılması təsadüfi deyildir. O zaman Heydər Əliyevin SSRİ Ali Sovetinin sessiyasında etdiyi «Ümumtəhsil və peşə məktəbi islahatının əsas istiqamətləri haqqında» tarixi məruzəsində irəli sürülmüş bir çox müddəalar indi Azərbaycanda həyata keçirilən təhsil islahatlarının aparıcı ideyasını, nəzəri mənbəyini təşkil edir.

(Davamı 2-ci səhifədə)

# Həyatın və zamanın fövqündə

(Əvvəli 1-ci səhifədə)

Heydər Əliyevin milli təhsil sistemimizin inkişafındakı böyük xidmətlərindən biri də 1970-1980-ci illərdə şəxsi təşəbbüsü və qayğısı sayəsində Azərbaycandan kənarda keçmiş Sovet İttifaqının 50-dən çox şəhərinin 170-dən artıq məşhur ali məktəblərində ən zəruri ehtiyac duyulan 250-dən çox ixtisas üzrə 15 mindən artıq azərbaycanlı gəncin təhsil almasıdır. Müqayisə üçün deyək ki, 1970-ci ildə Azərbaycandan başqa respublikaların ali məktəblərinə cəmi 60 nəfər tələbə göndərilmişdirsə, 1975-ci ildə 674 nəfər, yəni 11 dəfədən çox tələbə göndərilmişdir. Bu, böyük tarixi-mədəni nailiyyət idi və bu tarixi uğur Heydər Əliyevin adı ilə bağlıdır. Heydər Əliyev Azərbaycandan kənarda təhsil almış yüksəkixtisaslı mütəxəssisləri «Azərbaycanın yetirmələri, Azərbaycanın milli sərvəti» kimi yüksək qiymətləndirərək onların potensial imkanlarının bir istiqamətdə cəmləşdirilməsi, müstəqil Azərbaycanın sosial-iqtisadi və mədəni quruculuğunda səmərəli istifadə olunması üçün dəyərli tövsiyələr vermişdir.




Azərbaycanlı gənclərin xaricdə təhsili sahəsindəki bu uzaqgörən siyasəti müasir dövrümüzdə Azərbaycan Prezidenti cənab İlham Əliyev uğurla davam etdirir. Belə ki, «2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı» çərçivəsində 5 min nəfər azərbaycanlı gəncin xaricdə ölkəmiz üçün vacib olan ixtisaslar üzrə təhsil alması nəzərdə tutulur. Bugünədək həmin Dövlət Proqramı çərçivəsində 3185 nəfər azərbaycanlı gənc xaricə təhsil almağa göndərilib, 755 nəfər gənc isə xaricdə ali təhsilini başa vurub.

1969-1982-ci illərdə məktəbəqədər tərbiyə müəssisələrinin sayı 1600-dən 1875-ə çatmışdı. Həmin illərdə Azərbaycanın şəhər, kənd və qəsəbələrində 700-ə qədər yeni məktəb binası tikilib istifadəyə verilmişdi. Ümummilli lider Heydər Əliyevin şəxsi təşəbbüsü və təşkilatçılığı ilə Azərbaycanda 1970-1982-ci illərdə 5 yeni ali təhsil müəssisəsi yaradılmış, ali məktəb tələbələrin sayı isə 70 mindən 100 min nəfərə çatdırılmışdı.

Ulu öndər Heydər Əliyev həmin uzaqgörən siyasəti azərbaycanlı hərbi mütəxəssislərin yetişdirilməsi sahəsində də həyata keçirirdi. Təkcə 1982-ci ildə keçmiş Sovetlər Birliyinin ali hərbi məktəblərinə 550 nəfər azərbaycanlı gənc qəbul edilmişdi. Cəmşid Naxıçvanski adına Hərbi Liseyin yaradılması da ulu öndər Heydər Əliyevin adı və vətənpərvər fəaliyyəti ilə bağlıdır.

Müstəqillik dövründə onun yenidən böyük siyasətə qayıdışı Azərbaycan təhsilini durğunluqdan və əldə edilmiş nailiyyətlərin itirilməsindən xilas etdi. 1995-ci ildə təhsilə ayrılan vəsait ümumi dövlət büdcəsinin 10, 1997-ci ildə 20, 2001-ci ildə 23 faizini təşkil etmişdir. Bu müddətdə müəllim və tərbiyəçilərin əməkhaqqı 9 dəfə artmışdır.

Əminliklə deyə bilərik ki, Azərbaycanın XX əsr tarixində respublikanın heç bir dövlət rəhbəri ali məktəblərin həyatı, onun fəaliyyəti ilə Heydər Əliyev qədər ciddi maraqlanmamışdır. Heydər Əliyev respublikaya rəhbərlik etdiyi ilk günlərdən ali məktəblərə qayğısını əsirgəmədi, dövlətin maddi və mənəvi dəstəyini göstərdi, təhsil işçilərinə hər cür köməklik etməyi özünün başlıca vəzifəsi bildi. Respublikamızda ali pedaqoji təhsilin flaqmanı sayılan Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) də elmi və pedaqoji kadr hazırlığı sahəsində uğurları bilavasitə Heydər Əliyevin adı və yorulmaz fəaliyyəti ilə bağlıdır. Böyük öndərimiz ADPU-nun tədris və elmi həyatı ilə daim maraqlanınış, Pedaqoji Universitetin yenidən qurulması, genişlənib möhkəmlənınəsi üçün ciddi tədbirlər həyata keçirmişdir. Bu qayğı və diqqət bu gün də cənab Prezidentimiz tərəfindən davam etdirilir.

Ulu öndər Heydər Əliyev 1993-cü ilin iyununda yenidən respublikamızda hakimiyyətə qayıtdıqdan sonra da ali məktəblərin fəaliyyəti ilə ciddi şəkildə maraqlanmağa başladı. Vaxtının azlığına baxmayaraq, 1998-ci ilin sentyabr ayının 28-də Azərbaycan Tibb Universitetinin (ATU) yeni korpusunun istifadəyə verilməsinə həsr olunınuş təntənəli mərasimdə şəxsən iştirak etdi. Yeni binanın tədris və təchizatı ilə tanış oldu, məsləhətlərini, tövsiyələrini verdi. Bakı Dövlət Universitetinin (BDU) 80 illiyi münasibətilə 1999-cu il sentyabr ayının 28-də BDU-nun tələbələri, professor-müəllim heyəti və əməkdaşları ilə görüşü müdrik rəhbərimizin xalq maarifinə və təhsil işinə hamiliyini göstərən çox mühüm amillərdəndir.

Qətiyyətlə demək olar ki, Heydər Əliyevin Azərbaycana uzunmüddətli rəhbərliyinin ən sanballı göstəricilərindən biri də respublikada Azərbaycançılıq məfkurəsinin və milli ruhun hədsiz yüksəlişi, milli özünüdərkin keçmişin bütün buxovlarından azad olması, xalqın tarixi yaddaşının özünə qaytarılması kimi fundamental prinsiplər əsasında milli dövlətçilik arzularının və hislərinin güclənınəsi, real siyasi amilə çevrilməsidir. Azərbaycanın intibah dövrü kimi səciyyələndirilən 70-80-ci illər xalqımızın qəlbində, düşüncələrində illərlə yığılıb qalmış milli ideyanın-azadlıq, müstəqillik, suveren Azərbaycan dövləti ideyalarının canlanmasına, gələcəkdə qüdrətli milli-azadlıq hərəkatının ideya-mənəvi əsası və hərəkətverici özəyi dərəcəsinə yüksəlməsinə zəmin yaratdı.

Rektor Y.Məmmədov maraqlı və məzmunlu çıxışına davam edərək bildirib ki, bütün milli, siyasi, ideoloji və mənəvi azadlıqların kökündə iqtisadi azadlıq dayanır. Müdrik siyasi xadim Heydər Əliyev deyirdi: «Güclü iqtisadiyyat güclü dövlət, güclü ordu deməkdir». Bu baxımdan, ulu öndər Heydər Əliyev müstəqil Azərbaycanın iqtisadi cəhətdən qüdrətli bir dövlətə çevrilməsi üçün səmərəli fəaliyyət proqramı gerçəkləşdirdi. Ümummilli Liderin böyük qətiyyət və uzaqgörənliklə müəyyənləşdirdiyi yeni neft strategiyasına uyğun olaraq 1994-cü il sentyabrın 20-də Bakıda dünyanın aparıcı neft şirkətləri ilə «Əsrin müqaviləsi»nin imzalanması suveren Azərbaycana böyük iqtisadi və siyasi dividendlər gətirdi.



Böyük şəxsiyyət Heydər Əliyev sözün həqiqi mənasında milli təəssübkeşimiz idi. Hər bir zaman ən yüksək və ən mötəbər kürsülərdə «Hər bir insanın milli mənsubiyyəti onun qürur mənbəyidir. Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən azərbaycanlıyam!» deyən Heydər Əliyev ən böyük Azərbaycanlı idi.

Xalqımızın dilinə, zəngin mədəni irsinə, yüksək milli-mənəvi dəyərlərinə böyük qayğı və diqqət göstərilməsi də ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətinin əsas istiqamətlərindən biri olmuşdur. Hələ 1978-ci ildə Ulu Öndərin qətiyyət və fədakarlığı sayəsində Azərbaycan dili dövlət dili kimi Konstitusiyaya salınmışdı. Ulu öndər Heydər Əliyev Azərbaycan dilinə olan böyük məhəbbətini, sonsuz ehtiramını müstəqil ölkəmizə rəhbərlik etdiyi dövrlərdə daha yüksək səviyyədə göstərmişdir. Ulu Öndər 18 iyun 2001-ci il tarixdə «Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında» fərman, 4 iyul 2001-ci il tarixdə «Azərbaycan Respublikası Dövlət Dil Komissiyasının tərkibinin təsdiq edilməsi haqqında» sərəncam, 9 avqust 2001-ci il tarixdə «Azərbaycan əlifbası və Azərbaycan dili günü təsis edilməsi haqqında» sərəncam, 2 yanvar 2003-cü il tarixdə isə «Azərbaycan Respublikasında Dövlət dili haqqında» Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə» fərman imzalamışdır.

Qüdrətli siyasi xadim Heydər Əliyev respublikamızda yenidən hakimiyyətə qayıtdıqdan sonra təhsil müəssisələrinin normal fəaliyyət göstərməsi və təhsilin milli tərəqqimizin əsas amilinə çevrilməsi üçün ölkəmizdə geniş islahatlar proqramı işlənib hazırlandı. «Təhsil millətin gələcəyidir!» deyən ulu öndər Heydər Əliyev 1998-ci ilin martında «Azərbaycan Respublikasında təhsil sahəsində islahatlar üzrə Dövlət Komissiyası yaradılması haqqında» sərəncam imzaladı. Hərtərəfli müzakirələrdən sonra 1999-cu ilin iyununda «Azərbaycan Respublikasında təhsil sahəsində İslahat Proqramı» təkmilləşdirilmiş variantda təsdiq edildi.

Ümummilli lider Heydər Əliyevin müəyyənləşdirdiyi strateji kurs və Azərbaycan Prezidenti cənab İlham Əliyevin bu kursu uğurla davam etdirməsi, təhsilə göstərdiyi müntəzəm diqqət və qayğı sayəsində son illər ölkəmizdə təhsilin, o cümlədən ali pedaqoji təhsilin dinamik inkişafında böyük nailiyyətlər əldə edilmişdir. Dövlət başçımız təhsili Azərbaycanın davamlı inkişaf strategiyasının ən öncül istiqamətlərindən biri hesab edərək demişdir: «Azərbaycanın gələcək inkişafı məhz təhsillə bağlıdır. Bilikli, savadlı uşaqlar, gənclər gələcəkdə Azərbaycanı idarə edəcəklər. Təhsil bilik, elm, tərəqqi deməkdir. Təhsilə qoyulan vəsait ölkəmizin gələcəyinə qoyulan vəsaitdir. Bütün inkişaf etmiş ölkələrin uğurlarının səbəbi də məhz ziyalı təbəqəsidir, elmi-texniki tərəqqidir, texnoloji yeniliklərdir. Biz də bu yolu seçmişik». Bu konseptual fikirlər Azərbaycanda təhsilin inkişafının strategiya və konsepsiyasını müəyyənləşdirir.

Məktəblərin infrastrukturunun yeniləşdirilməsi sahəsində Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, UNESCO-nun və ISESCO-nun xosməramlı səfiri Mehriban xanım Əliyevanın müstəsna xidmətləri var. Heydər Əliyev Fondu tərəfindən xüsusi qayğıya ehtiyacı olan, kimsəsiz, valideyn himayəsindən məhrum olmuş uşaqların təhsilinin inkişafı, onların təhsil aldığı müəssisələrin maddi-texniki və tədris bazasının möhkəmləndirilməsi istiqamətində də məqsədyönlü işlər görülmüşdür. Azərbaycan təhsilinin, elminin inkişafına, milli-mənəvi dəyərlərimizin qorunmasına, bütün dünyada təbliğinə önəmli töhfələr verən Mehriban xanım Əliyevanın həyata keçirdiyi layihələr, humanitar yönümlü proqramlar Azərbaycandan çox-çox uzaqlarda da böyük rəğbətlə qarşılanır.

Rektor Y.Məmmədov çıxışının bu məqamında deyib: "Cəmiyyətdə insanı insanlardan fərqləndirən, onu yaddaşlarda əbədi yaşadan əsas şərt şəxsiyyətin bütövlüyüdür. Ulu öndər Heydər Əliyev də öz yenilməz iradəsi, qətiyyəti, müdrikliyi ilə bütöv şəxsiyyət idi. Sağlıqlarında xalqına, millətinə vicdanla xidmət edən böyük şəxsiyyətlər fiziki yoxluqlarından sonra da gərəkli olurlar. Ulu öndər Heydər Əliyev həm də öz böyük adı, mütərəqqi fikir və idealları ilə bütün bəşəriyyətin yaddaşına əbədi köçmüşdür. Xalqımızın, millətimizin fədaisi olmuş ümummilli liderimiz Heydər Əliyev cismən bizim aramızda olmasa da, ruhən, mənən həmişə bizimlədir. Ulu Öndərimizin xatirəsi bizim üçün çox əziz və unudulmazdır. Bir sözlə, nə qədər müstəqil Azərbaycan xalqı, Azərbaycan dövləti var, ulu öndərimiz Heydər Əliyev də bizimlədir!"

Rektor Y.Məmmədov çıxışının sonunda ulu öndər Heydər Əliyevi anım mərasiminin təşkil edilməsində fəal iştirak etdiklərinə görə ADPU-nun müəllim və tələbələrinə öz təşəkkürünü bildirib.

Anım mərasimində müdrik şəxsiyyət Heydər Əliyevin həyatından bəhs edən kinosujetlər göstərilib, eyni zamanda tələbə-gənclərin Ulu Öndərlə bağlı fikirləri səsləndirilib. Filologiya fakültəsinin II kurs tələbəsi Nərmin Səlimova Xalq şairi Zəlimxan Yaqubun "Prezident ömrünün son saatları" şeirini ifa edib. ADPU-nun birləşmiş xoru musiqisi Nailə Mirməmmədliyə, sözləri Nərmin Kamilovaya aid olan "Ürəklərdə yaşasın" mahnısını, həmçinin "Xalq Heydər deyəcək" mahnısını ifa edib. Eyni zamanda Kimya fakültəsinin III kurs tələbəsi Xədicə Məhərrəmova "Hələ çiynimizdədir uğurlu əlin sənin", həmin fakültənin I kurs tələbəsi Səbinə Fərhadlı "Axtarır səni" və həmin fakültənin IV kurs tələbəsi Lalə Rəsulzadə "Sənin yerin görünəcək", Filologiya fakültəsinin I kurs tələbəsi Cəmilə Məhərrəmova "Azərbaycan-dünya mənim", Kimya fakültəsinin IV kurs tələbəsi Rafiq Məmmədzadə "Vətənimdir", Pedaqogika və psixologiya fakültəsinin I kurs tələbəsi Arıq Medr Əli "Azərbaycanım" şeirlərini söyləyiblər. Tədbirin sonunda ADPU-nun birləşmiş xoru və solist Fəxri Hüseynov Müslüm Maqomayevin "Azərbaycan" mahnısını ifa ediblər.

**Mənsur İBRAHİMLİ,**
**Azərbaycan Jurnalistlər Birliyinin üzvü,**
**Gülnar SÜLEYMANOVA,**
**Azərbaycan Jurnalistlər Birliyinin üzvü**

# İmtahan sessiyasının təşkili və keçirilməsi barədə Azərbaycan Respublikası Təhsil nazirinin əmri

Ali təhsil müəssisələrində 2014/2015-ci tədris ilinin payız semestrinin imtahan sessiyasını (bundan sonra imtahan sessiyası) mövcud qaydalara uyğun təşkil etmək, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığı və obyektivliyi təmin etmək məqsədilə

**ƏMR EDİRƏM:**

1. Ali təhsil müəssisələrinin rəhbərləri:

- imtahan sessiyasının mövcud normativ sənədlər əsasında təşkil olunmasını təmin etsinlər;
- rəhbərlik etdikləri ali təhsil müəssisələrində imtahan qərargahı yaratsınlar və qərargaha daxil olan hər bir şikayətin qısa müddətdə operativ şəkildə araşdırılmasını təmin etsinlər;
- imtahan sessiyasında şəffaflığı təmin etmək üçün imtahanlarda ictimaiyyətin və valideynlərin iştirakına şərait yaratsınlar;
- imtahanların təşkilində və gedişində nöqsanlara, neqativ hallara yol vermiş şəxslər barədə mövcud qanunvericiliyə uyğun tədbirlər görsünlər;
- nəzərə alsınlar ki, rəhbərlik etdikləri ali təhsil müəssisəsində baş verə biləcək hər bir neqativ hala görə məsuliyyət daşıyırlar;
- imtahan sessiyasının təşkili, keçirilməsi və nəticələri barədə sessiya bitdikdən sonra 10 gün müddətinə Təhsil Nazirliyinə yekun hesabat versinlər.

2. 2015-ci ildə Bakı şəhərində I Avropa Oyunlarının keçirilməsi ilə əlaqədar Bakı şəhərində yerləşən ali təhsil müəssisələrində payız semestrinin imtahan sessiyası 29 dekabr 2014-cü ildə başlasın və 18 yanvar 2015-ci il tarixində sona çatsın.

3. Təhsil nazirinin müavini (C.Bayramov), Aparatın rəhbəri (M.Eynullayev), Aparat rəhbərinin müavini (Y.Piriyev), Elm və ali təhsil (G.Hüseynova) və Daxili nəzarət (K.Quliyev) şöbələrinə tapşırılsın:

- imtahan sessiyasına hazırlıq dövründə və sessiya müddətində ali təhsil müəssisələrində baş vermiş neqativ hallarla bağlı daxil olan məlumatları operativ araşdırsınlar və onların yol verilməsində günahı olan şəxslər barədə tədbir görmək üçün təkliflər hazırlasınlar;
- ali təhsil müəssisələrində payız semestrinin imtahan sessiyalarının nəticələrini təhlil edib müvafiq arayışları müzakirəyə təqdim etsinlər.

4. Nazirliyin İnformasiya şöbəsinin müdir müavini, QHT və KİV-lə iş sektorunun müdiri (C.Valehov) Təhsil Nazirliyinin "Qaynar xətt" xidmətinin fəaliyyəti və imtahan sessiyasının gedişi barədə kütləvi informasiya vasitələrinə müntəzəm olaraq məlumat verilməsini təmin etsin.

5. Əmr "Azərbaycan müəllimi" qəzetində dərc edilsin və nazirliyin internet saytında yerləşdirilsin.

6. Əmrin icrasına nəzarəti öz üzərimə götürürəm.

**Mikayıl CABBAROV,**
**Azərbaycan Respublikasının Təhsil naziri**

*4 dekabr 2014-cü il*

# Elmi Şuranın 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəyliyi Gününə həsr edilmiş xüsusi iclası keçirilib

**Dekabr ayının 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Gününə həsr edilmiş xüsusi iclası keçirilib. İclası ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Elmi Şuranın sədri, professor Yusif Məmmədov açaraq Şura üzvlərini və eləcə də universitetin kollektivini 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə təbrik edib, onlara möhkəm cansağlığı, uzun ömür, əmin-amanlıq, xoşbəxtlik, firavanlıq, elm və təhsildə uğurlar arzulayıb. Rektor Yusif Məmmədov 31 dekabrın Azərbaycan xalqı üçün vacib bayramlardan biri olduğunu qeyd etmiş, yaranma tarixindən bəhs etmişdir. Demişdir ki, 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü artıq 23 ildir ki, respublikamızda geniş miqyasda qeyd edilir. Bu gün yalnız müstəqil Azərbaycan Respublikasında yaşayan soydaşlarımızın deyil, eləcə də bütün dünyada yaşayan 50 milyondan çox həmvətənlərimizin ən əziz bayramlarından biridir. Çünki ümummilli bayram kimi qeyd etdiyimiz bu bayramın məzmun və mahiyyətində xalqımıza, millətimizə mənsubluq, ulu öndərimiz Heydər Əliyevin müstəqil dövlətimizin milli ideologiyası kimi rəsmiləşdirdiyi azərbaycançılıq ideyasına və yüksək milli-mənəvi dəyərlərimizə sədaqət hissi dayanır.**



Rektor Y.Məmmədov bildirmişdir ki, ulu öndərimiz Heydər Əliyev hələ 1990-1993-cü illərdə blokada şəraitində yaşayan Naxçıvanda olarkən böyük sıxıntı və təzyiqlərə baxmayaraq, xalqımızın müstəqillik uğrunda apardığı fədakar mübarizəyə ideya-siyasi istiqamət verməklə yanaşı, dünyada yaşayan bütün azərbaycanlıların vahid milli ideologiya ətrafında sıx birləşməsinə böyük əhəmiyyət vermiş, bu istiqamətdə əməli fəaliyyət göstərərək lazımi addımları atmışdır. Belə ki, ulu öndər Heydər Əliyevin rəhbərlik etdiyi Naxçıvan Muxtar Respublikasının Ali Məclisi 1991-ci il dekabr ayının 16-da hər il dekabrın 31-nin dünyada yaşayan Azərbaycanlıların Həmrəyliyi Günü kimi qeyd edilməsi haqqında qərar qəbul etmişdir. Naxçıvan Ali Məclisinin bu qərarı əsasında Azərbaycan Respublikasının Ali Sovetinin Milli Şurası 1991-ci il dekabr ayının 25-də 31 dekabrın "Dünyada Yaşayan Azərbaycanlıların Həmrəyliyi Günü" kimi qeyd edilməsi haqqında qərar qəbul etmiş, 1992-ci il oktyabr ayının 27-də isə "Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü haqqında" Qanun imzalamışdır. Lakin həmin dövrdə bu qanunların həyata keçirilməsi üçün əməli tədbirlər gerçəkləşdirilməmişdir. Yalnız dahi öndərimiz Heydər Əliyev xalqımızın çox böyük istəyi və inadlı tələbi ilə yenidən respublikamızın rəhbərliyinə qayıtdıqdan sonra dünyada yaşayan azərbaycanlıların təşkilatlanmalarına və özlərini bir millət kimi təsdiqləmələrinə xüsusi əhəmiyyət vermiş və ümummilli əhəmiyyət kəsb edən bu işin yüksək səviyyədə qurulması üçün mümkün olan bütün tədbirləri həyata keçirmişdir. 1994-cü il fevral ayının 10-da Türkiyədə səfərdə olarkən bu ölkədə yaşayan azərbaycanlılarla görüşən ulu öndər Heydər Əliyev onları milli birliyə, həmrəyliyə və təşkilatlanmağa çağırmışdır. Ümummilli Liderin rəhbərliyi ilə 1997-ci il dekabr ayının 27-də Respublika Sarayında (indiki Heydər Əliyev Sarayı) keçirilən görüş dünyada yaşayan azərbaycanlıların həmrəyliyinin yaradılması istiqamətində atılan əsas addımlardan biri olmuşdur. 2001-ci il may ayının 23-də Ulu Öndər Dünya Azərbaycanlılarının I Qurultayının Bakıda keçirilməsi haqqında sərəncam imzalamışdır. Məhz Ulu Öndərimizin şəxsi təşəbbüsü, böyük səyləri və birbaşa rəhbərliyi ilə 2001-ci il noyabr ayının 9-10-da Bakıda Dünya Azərbaycanlılarının I Qurultayı keçirilmişdir. Həmin qurultayda çıxış edən müdrik rəhbərimiz dünyanın bütün ölkələrində yaşayan azərbaycanlıları milli birliyə çağırmış, onları hər yerdə, hər bir zaman Azərbaycan adını doğrultmağa və daha da ucaltmağa səsləmişdir. Ümummilli liderimiz Heydər Əliyev həmin qurultayda Azərbaycan diasporunun nümunəsində uğurlu diaspor fəaliyyətinin modelini belə müəyyən etmişdir: "Biz istəyirik ki, dünyanın müxtəlif ölkələrində yaşayan azərbaycanlılar həmin ölkələrin qanunları əsasında yaxşı yaşasınlar və öz mövqelərini gücləndirsinlər. Biz istəyirik ki, hər bir azərbaycanlı yaşadığı ölkənin ictimai-siyasi həyatında fəal iştirak etsin, layiqli yer tutsun və cəmiyyətdə nüfuzu olsun. Lakin bununla yanaşı, öz milli kökünü, milli mənsubiyyətini heç zaman unutmasın". Dünya Azərbaycanlılarının I Qurultayında ulu öndər Heydər Əliyev Azərbaycançılığı belə səciyyələndirmişdir: «Azərbaycançılıq öz milli mənsubiyyətini qoruyub-saxlamaq, milimənəvi dəyərlərini qoruyub-saxlamaq, eyni zamanda onların ümumbəşəri dəyərlərlə sintezindən, inteqrasiyasından bəhrələnmək və hər insanın inkişafının təmin olunması deməkdir».



Ulu öndər Heydər Əliyev xarici ölkələrdə fəaliyyət göstərən Azərbaycanın diaspor təşkilatlarının vahid bir mərkəzdən idarə olunması və onların fəaliyyətinin koordinasiya olunması üçün 2002-ci ildə Xarici Ölkələrdə Yaşayan Azərbaycanlılarla İş üzrə Dövlət Komitəsini yaratmışdır. 2008-ci ildə isə həmin Komitənin bazası əsasında Diasporla İş üzrə Dövlət Komitəsi yaradılmışdır. Bütün bunlarla bərabər, ulu öndərimiz Heydər Əliyev xarici ölkələrə etdiyi çoxsaylı səfərlər zamanı da dünyanın müxtəlif ölkələrində yaşayan azərbaycanlılarla bu sahədə lazımi iş aparmışdır.

Xalqımızın vətənpərvər oğlu, milli təəssübkeşi, ulu öndəri Heydər Əliyevin siyasi kursunu çox uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev bütün dünyada yaşayan azərbaycanlıların vahid amal uğrunda mübarizə aparmalarına və təşkilatlanmalarına böyük qayğı və diqqət göstərir. 2006-cı il fevralın 8-də dövlət başçımız cənab İlham Əliyev Dünya Azərbaycanlılarının II Qurultayının keçirilməsi haqqında müvafiq sərəncam imzalamışdır. 2006-cı ilin mart ayının 16-da Bakıda Dünya Azərbaycanlılarının II qurultayı keçirilmişdir. 2011-ci il iyul ayının 5-də isə Bakıda Dünya Azərbaycanlılarının III Qurultayı keçirilmişdir. Hər iki qurultay bütün dünyada yaşayan azərbaycanlıların təşkilatlanmaları baxımından mühüm rol oynamış, onların vahid məqsəd və ideya ətrafında sıx birləşmələrinə öz layiqli töhfələrini vermişdir.

Rektor Y.Məmmədov qeyd etmişdir ki, cənab Prezidentimiz xarici ölkələrə etdiyi səfərlər zamanı da həmin ölkələrdə yaşayan azərbaycanlılarla görüşlər keçirir və bu vacib istiqamətdə hərtərəfli səmərəli fəaliyyət göstərir. Eyni zamanda dövlət başçımız xarici ölkələrdə Azərbaycanın diaspor təşkilatlarına rəhbərlik edən şəxslərə də bu istiqamətdə fəaliyyətlərini gücləndirmək üçün lazımi tövsiyələrini verir. Hazırda xarici ölkələrdə fəaliyyət göstərən çoxlu sayda diaspor təşkilatlarımız bütün dünyada Azərbaycan həqiqətlərinin, xüsusilə də Ermənistan-Azərbaycan-Dağlıq Qarabağ münaqişəsi haqqında həqiqətlərin dünya ictimaiyyətinə çatdırılması üçün əzmlə çalışır.

Uzaqgörən bir siyasət və dövlət xadimi olan Azərbaycan Prezidenti İlham Əliyev yalnız dünya azərbaycanlılarının deyil, həm də türkdilli xalqların siyasi və mənəvi birliyinə böyük əhəmiyyət verir. Bu baxımdan, bir müddət öncə Azərbaycanla Türkiyə arasında yüksək strateji əməkdaşlıq haqqında əldə edilmiş razılıq da böyük əhəmiyyət kəsb edir. Hazırda Türkiyə-Azərbaycan Yüksək Strateji Əməkdaşlıq Şurası fəaliyyət göstərir.

Rektor Y.Məmmədov çıxışının bu yerində Dünya Azəbaycanlılarının Həmrəyliyi Günü üçün məhz 31 dekabr tarixinin müəyyənləşdirilməsinin ümummilli lider Heydər Əliyevin düşünülmüş mövqeyinin nəticəsi kimi qəbul etdiyini söyləmişdir.

Rektor Y.Məmmədov eyni zamanda Bakı şəhərində yerləşən təhsil müəssisələrində cari tədris ilinin qrafik dəyişikliyindən də geniş bəhs etmişdir. 2015-ci ildə Bakı şəhərində I Avropa Oyunlarının keçirilməsi ilə əlaqədar respublika Nazirlər Kabinetinin oktyabr ayının 24-də xüsusi sərəncam verdiyini, həmin sərəncama uyğun olaraq Bakı şəhərində yerləşən təhsil müəssisələrində 2014-2015-ci dərs ilində tədris prosesinin qrafikinin dəyişdirilməsi ilə əlaqədar Təhsil Nazirliyinin də xüsusi əmri olduğunu diqqətə çatdırmışdır. Qeyd etmişdir ki, əmrə əsasən cari dərs ilinin 2015-ci il may ayının 31-ə qədər başa çatdırılması və həmin məqsədlə mövcud dərs ilində təlim müddətini dəyişmədən imtahan sessiyaları üçün ayrılmış 5 həftə müddətinin 3 həftəyə qədər, qış tətili müddətinin isə 2 həftədən 1 həftəyə qədər azaldılması nəzərdə tutulur. Bu isə özlüyündə ADPU-da həm əyanı, həm də qiyabi şöbədə tədris prosesinin qrafikində, imtahan sessiyasının və qış tətilinin müddətlərində, həmçinin yaz semestrinin və yaz semestri imtahan sessiyasının müddətlərində, eləcə də ixtisaslar üzrə müxtəlif istiqamətli pedaqoji təcrübələrin və Buraxılış Yekun Dövlət Attestasiyasının keçirilmə müddətlərində müvafiq dəqiqləşdirmələr aparılması zərurətini meydana çıxarmışdır.

Rektor Y.Məmmədovun çıxışından o da məlum olmuşdur ki, payız semestrinin imtahan sessiyası yanvar ayının 1-i və 2-si istisna olmaqla, dekabrın 29-dan yanvar ayının 18-ə qədər (şənbə və bazar günləri də daxil olmaqla) davam edəcəkdir.

Çıxışının sonunda rektor Y.Məmmədov 2013-cü ilin "İlin alimi" müsabiqəsi qaliblərinin diplomlarını təqdim etmişdir.

* * *

"2014-2015-ci tədris ilinin payız semestrinin imtahan sessiyasına hazırlığın vəziyyəti və qarşıda duran vəzifələr haqqında" universitetin Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov məlumat vermişdir. Qeyd etmişdir ki, tədris prosesinin təşkili və onun idarə olunması müvafiq əsasnamələr və qaydalar, həmçinin təlimati məktublar əsasında qurulmuşdur. Bu tədris semestrində də universitetin fakültə, kafedra və digər struktur bölmələrində aparılan işlərin əsas istiqamətlərini tədris prosesinin təşkili və təkmilləşdirilməsi, təlimin keyfiyyətinin yüksəldilməsi, tələbələrin müvafiq tədris-metodik ədəbiyyatla təmin edilməsi təşkil etmişdir.

Prorektor M.Cəbrayılov çıxışının bu yerində qeyd olunan vəzifələrin yerinə yetirilməsi üçün fakültə dekanlarının və kafedra müdirlərinin üzərinə ciddi məsuliyyət düşdüyünü diqqətə çatdırmış, tələbələrin dərsə davamiyyətinin tədris prosesinin mühüm parametrlərindən biri olduğunu söyləmişdir.

Payız semestrinin imtahan sessiyasında imtahanların yazılı və İKT-nin tətbiqi ilə aparılmasına dair ADPU-nun rektoru, professor Y.Məmmədovun müvafiq əmri olduğunu, əmrə uyğun olaraq imtahanların aparılmasına nəzarəti təmin etmək məqsədilə imtahan rəhbərlərinin və nəzarətçi-müəllimlərin təyin olunduğunu, sessiyanın obyektiv, şəffaf və mütəşəkkil keçirilməsini, həmçinin imtahanların gedişi ilə bağlı daxil olan ərizə, şikayət və təkliflərin çevik araşdırılmasını təmin etmək məqsədilə 11 nəfərdən ibarət "İmtahan qərargahı", universitet üzrə Münaqişə Komissiyası və eləcə də fakültələr üzrə münaqişə komissiyalarının yaradıldığını söyləmişdir.

Prorektor M.Cəbrayılovun çıxışından o da məlum olmuşdur ki, bakalavriat pilləsində həm əyani, həm də qiyabi şöbə üzrə bütün kurslarda imtahanlar İKT üsulu ilə aparılır. I kurs tələbələrinin imtahanlarının test üsulu ilə, kompüter vasitəsilə aparılmasına hazırlığını təmin etmək məqsədilə müvafiq treninqlər keçirilmişdir. İmtahanlara hazırlıqla əlaqədar fənlər üzrə kollokviumlar keçirilmişdir.

Respublika paytaxtında Birinci Avropa Oyunlarının keçirilməsi ilə bağlı olaraq tədris müddətinin və imtahanların gedişində edilmiş müvafiq dəyişikliklərdən bəhs edərkən prorektor M.Cəbrayılov əlavə olaraq bildirmişdir ki, payız semestrinin imtahan sessiyasının kredit borclarının ləğvi prosesi imtrahanlar başa çatdığı gündən - yanvar ayının 18-dən etibarən 1 həftə müddətinə (yanvarın 25-ə qədər) aparılacaqdır.

* * *

"Pedaqoji və tədris təcrübələrinin yekunları və qarşıda duran vəzifələr haqqında" universitet üzrə pedaqoji təcrübənin rəhbəri, dosent Xankişi Məmmədov, "TEC xətti ilə tələbələrin elmi-tədqiqat işlərinə cəlb edilməsi" haqqında TEC-in sədri, dosent Əli Zalov hesabat vermişlər.

Sonra universitetin elmi katibi, dosent Laçın Həsənova Azərbaycan Respublikasının Dövlət Bayrağı haqqında Təhsil nazirinin müavini Ceyhun Bayramovun məktubunu və magistratura pilləsinin müəyyən ixtisasları üzrə 2012-ci ildə təsdiq edilmiş tədris planlarında humanitar fənlər bölümü üzrə nəzərdə tutulan seçmə fənlər siyahısına "Fəlsəfə" fənninin daxil edilməsi barədə Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramovun təqdimatını oxumuşdur.

Sonda dosent L.Həsənova ADPU rektorunun adına daxil olmuş təşəkkür məktubları və Riyaziyyat və informatika fakültəsinin Funksiyalar nəzəriyyəsi kafedrasının dosenti Rahib Abbasovun "Avropa keyfiyyəti" qızıl medalı və "Avropa elmi və sənaye konsorsiumunun - Vilhelm Leybniz" medalı ilə təltif olunduğu barədə Elmi Şura üzvlərini məlumatlandırmışdır.

**A.İSGƏNDƏROV**

# Ümumtəhsil məktəb şagirdlərinin mütaliə vərdişlərinin təkmilləşdirilməsi və onlarda mütaliə mədəniyyətinin formalaşdırılması ilə bağlı tədbirlər barədə *Azərbaycan Respublikası Təhsil nazirinin əmri*

Əsrlərdən bəri yaranıb inkişaf edərək bəşəriyyətin söz sənəti xəzinəsinə incilər bəxş etmiş Azərbaycan ədəbiyyatının, eləcə də dünya ədəbiyyatının humanizm ruhlu seçmə nümunələri onları mütaliə edən hər bir şəxs üçün əsl həyat məktəbidir.

Şəxsiyyət olaraq insanın formalaşıb kamilləşməsində, mənəvi aləminin zənginləşməsində, dünyagörüşünün və bilik dairəsinin genişlənməsində, cəmiyyət hadisələrinə çevik, həssas və obyektiv münasibət bəsləməsində, bədii təxəyyülünün, obrazlı və məntiqi təfəkkürünün, idraki bacarıqlarının inkişafında, bir çox hallarda isə həyat yolunun müəyyənləşməsində və vətəndaşlıq tərbiyəsində mütaliənin rolu müstəsna əhəmiyyət kəsb edir. Qloballaşmanın qarşısıalınmaz prosesə çevrildiyi hazırkı dövrdə milli dəyərlərin, xalqımızın mənəvi simasını əks etdirən mədəni irsinin və adət-ənənələrinin qorunub saxlanılaraq nəsildən-nəslə ötürülməsində və onların digər mədəniyyətlərlə müqayisə olunub müvafiq nəticələr çıxarılmasında mütaliə əvəzsiz təsir gücünə malikdir.

Hazırkı vaxtda elmi-texniki tərəqqinin sürətli inkişafı ilə əlaqədar insanların məşğulluq və maraq dairəsi, ilbəil təkmilləşən texniki informasiya vasitələri ilə məlumatlanmaq imkanları genişlənsə də, mütaliə inkişafetdirici amillər arasında öncül mövqeyini saxlamaqdadır.

Bununla belə, aparılan pedaqoji müşahidələr və təhlillər göstərir ki, son zamanlar ümumtəhsil məktəblərində şagirdlərin mütaliəyə istiqamətləndirilməsi, onlarda mütaliə mədəniyyətinin formalaşdırılması üzrə zəruri tədbirlərin həyata keçirilməsi əvvəlki dövrlərlə müqayisədə zəifləmişdir. Bununla əlaqədar şagirdlərin mütaliəsi işinin təşkilindəki təcrübədə sınaqdan çıxmış ənənələri bərpa etmək, onların mütaliəyə həvəsini daha da gücləndirmək və mütaliə vərdişlərini inkişaf etdirmək təhsil sahəsində prioritet vəzifələrdən biridir.

Qeyd olunanlara əsasən, ümumtəhsil məktəb şagirdlərinin mütaliəyə istiqamətləndirilməsi işində səmərəli sistemin yaradılması məqsədilə "Azərbaycan Respublikası Təhsil Nazirliyi haqqında Əsasnamə"nin 13.5-ci bəndini rəhbər tutaraq

**Ə M R  E D İ R Ə M:**

1. Naxçıvan MR Təhsil Nazirliyinə, Bakı Şəhəri üzrə Təhsil İdarəsinə, Gəncə Şəhər Təhsil İdarəsinə, rayon (şəhər) təhsil şöbələrinə, Təhsil Nazirliyi tabeliyindəki ümumi təhsil müəssisələrinin rəhbərlərinə tapşırılsın ki:

1.1.Bu əmrin məzmununun pedaqoji kollektivlərə çatdırılmasını təmin etsinlər.

1.2.Aşağıda qeyd olunan istiqamətlər əsasında şagirdlərin mütaliəyə həvəsləndirilməsi və onlarda mütaliə mədəniyyətinin formalaşdırılmasına yönəlmiş fəaliyyət planı hazırlayıb icrasını təmin etsinlər:

- hər il yenilənməklə şagirdlərə mütaliə edilməsi tövsiyə olunan Azərbaycan və xarici ölkə yazıçılarının əsərlərinin təxmini siyahısının hazırlanması;
- məktəb kitabxanalarının yeni nəşrlərlə zənginləşdirilməsi, bunlarda dərs ili ərzində bədii əsərlərin oxusunun və müzakirəsinin təşkili;
- məşhur yazıçıların, o cümlədən ədəbiyyat sahəsində Nobel mükafatına layiq görülmüş yazıçıların, eləcə də tanınmış Azərbaycan ədiblərinin yaradıcılığı və əsərlərinin məzmunu haqqında şagirdlərə məlumatların çatdırılması yolu ilə onların bu əsərləri mütaliə etməyə istiqamətləndirilməsi;
- şagirdlərin müasir Azərbaycan yazıçıları ilə görüşlərinin keçirilməsi, bu prosesdə şagirdlərin həmin yazıçılar və onların əsərləri haqqında məlumatlandırılması, müvafiq təbliğat işlərinin həyata keçirilməsi;
- şagirdlərin oxuduqları və ya oxuyacaqları əsərlər əsasında hazırlanmış teatr tamaşalarına aparılması və onların müzakirəsinin keçirilməsi;
- oxuduqları əsərlər üzrə məktəblərdə şagirdlərin iştirakı ilə fraqmentlər şəklində səhnələşdirilmiş tamaşa nümunələrinin təşkili;
- şagirdlər tərəfindən oxunan və tamaşa olunan əsərlərin onların iştirakı ilə müzakirəsinin keçirilməsi, bu əsərlər əsasında yuxarı sinif şagirdlərinin təəssürat, rəy və mülahizə xarakterli inşa yazmalarının təşkil edilməsi;
- məktəblərdə "Ən fəal oxucu", "Bədii əsər haqqında ən yaxşı inşa", "Bədii əsər barədə ən mükəmməl rəy" müsabiqələrinin, ədəbi-bədii qiraət gecələrinin, hekayə axşamlarının keçirilməsi və qaliblərin rəğbətləndirilməsi;
- məktəblərdə oxuduqları əsərlərin sayına görə siniflər üzrə şagirdlərin reytinqinin müəyyən edilməsi və bu əsasda onların arasında sağlam rəqabət mühitinin yaradılması;
- mütaliə etdikləri kitablar barədə rəy və mülahizələrinin digər həmyaşıdları ilə onlayn mühitdə paylaşmalarına şagirdlərin istiqamətləndirilməsi və bununla əlaqədar onlara lazımi mənəvi və texniki dəstək göstərilməsi;

1.3.Əmrin yerinə yetirilməsinin gedişi barədə 2015-ci ilin aprelində Nazirliyə hesabat göndərsinlər.

2. Məktəbəqədər və ümumi təhsil şöbəsi (A.Əhmədov) bu əmrlə müəyyən edilmiş tədbirlərin həyata keçirilməsinin təmin olunması istiqamətində davamlı təşkilati işlər həyata keçirsin, təqdim edilən hesabatların təhlilini aparıb müvafiq təkliflər hazırlasın.

3. İqtisadiyyat şöbəsi (R.Orucov), Əsaslı tikinti və təchizat idarəsi (A.Axundov) ümumtəhsil məktəb kitabxanalarının davamlı olaraq bədii əsərlərlə zənginləşdirilməsi üçün müvafiq ədəbiyyatın alınmasını təmin etsinlər.

4. İnformasiya şöbəsi (E.Əliyev) şagirdlərin mütaliəsi işinin təşkili ilə bağlı görülən tədbirlərin KİV-lərdə işıqlandırılmasını, bu əmrin "Azərbaycan müəllimi" qəzetində dərc olunmasını və Nazirliyin internet saytında yerləşdirilməsini təmin etsin.

5. Əmrin icrasına nəzarət nazir müavini Ceyhun Bayramova həvalə olunsun.

**Mikayıl CABBAROV,**
**Azərbaycan Respublikasının Təhsil naziri**
*16 dekabr 2014-cü il*

# "Media və təhsil dialoqu" mövzusunda praktik konfrans keçirilib

Dekabrın 22-də Təhsil Nazirliyinin təşkilatçılığı ilə Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasında və Bakı Ali Neft Məktəbində "Media və təhsil dialoqu" mövzusunda praktik konfrans keçirilib.




Konfransda Təhsil Nazirliyinin nümayəndələri, ali təhsil müəssisələrinin mətbuat xidmətlərinin və media qurumlarının rəhbərləri, tanınmış təhsil ekspertləri, jurnalistlər iştirak ediblər.

Tədbiri giriş sözü ilə Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının rektoru Urxan Ələkbərov açaraq qonaqları salamlayıb.

"PR texnologiyaları" adlı I paneldə Təhsil Nazirliyinin İnformasiya şöbəsinin QHT və KİV-lə iş sektorunun müdiri Cəsarət Valehov "Press-relizlərin hazırlanması və yayılması" mövzusunda təqdimatla çıxış edib. Təqdimatda KİV-lə səmərəli və uğurlu münasibətlərin qurulması, press-relizin məzmunu və strukturu, xəbərlərdə nəyin əks etdirilməsinin vacibliyi, ictimaiyyətlə əlaqələrin qurulması məsələlərinə toxunulub.

Təhsil Nazirliyinin vebmasteri Mehman Şəfaqətov "Universitet saytları: hörümçək torunda haradasınız?" mövzusundakı təqdimatında ali məktəblərin veb resursları və virtual aləmdəki fəaliyyəti ilə bağlı aparılan monitorinqi iştirakçıların diqqətinə çatdırıb.

"Azad Azərbaycan" Müstəqil Teleradio Kompaniyasının vitse-prezidenti Məqsəd Nurun "Televiziyanın təhsil gözlüyü" mövsuzundakı təqdimatından sonra ali məktəblərin ən fəal media təmsilçiləri Təhsil Nazirliyinin diplomu ilə təltif edilib.



Sonra təqdimatlarla bağlı geniş müzakirələr aparılıb və çoxsaylı suallar cavablandırılıb.

Praktik konfrans Bakı Ali Neft Məktəbində davam etdirilib. II paneldə ilk çıxışı "Sosial media "mediadırmı?" mövzusundakı təqdimatla Bakı Dövlət Universitetinin kafedra müdiri Aynur Kərimova edib.

"APA-Holdinq"in prezidenti Vüsalə Mahirqızı isə onlayn medianın üstünlükləri, problemləri və inkişafı barədə danışıb. V.Mahirqızı "Onlayn media: tezbazar, yoxsa...?" adlı təqdimatında onlayn media nümayəndələrindən daha böyük məsuliyyət və peşəkarlıq tələb olunduğunu vurğulayıb.

Sonra Bakı Dövlət Universitetinin professoru Şirməmməd Hüseynov 90 illik yubileyi münasibətilə Bakı Ali Neft Məktəbi tərəfindən təbrik edilib.

Təhsil eksperti, professor Şahlar Əsgərov, Almaniyada yaşayan məşhur azərbaycanlı alim Məsud Əfəndiyev çıxış edərək tədbirin əhəmiyyətindən danışıblar.

"Azad Azərbaycan" televiziyası və "APA-Holdinq"in informasiya dəstəyi ilə təşkil olunmuş konfransda media və təhsil dialoqunun daha da yaxşılaşdırılması ilə bağlı müzakirələr aparılıb, müvafiq təklif və tövsiyələr səsləndirilib.

# Müəllimliyə gedən yolda mühüm mərhələ

Onlar sonuncu kurs tələbələridir. Fakt olaraq söz açdığımız isə Filologiya fakültəsinin IV kurs tələbələridir. Hər ötən gün, tələbəsi olduqları ADPU-da təhsil siyasəti ilə əlaqədar həyata keçirilən hər hansı tədbir onları rəsmi olaraq "müəllim" adı adı qazanacaqları zamana daha bir addım yaxınlaşdırır.



Yeni il qabağı cəm olduqları toplantı da məhz bu mövqeli toplantılardan biri idi - onlar özlərinin sonuncu pedaqoji təcrübələrini başa vurmuşdular. Əgər ilk günlər əlinə orta məktəb jurnalı götürüb sinifə daxil olarkən aralarında tək-tək də olsa çəkingənlik hiss olunan tələbə var idisə, pedaqoji təcrübənin başa çatmaqda olduğu vədələrdə özlərini artıq müəllim kimi hiss etmişdilər. Və arzusunda olduqları peşəyə yiyələnmək yolunda daha bir mərhələni adladıqlarından qürur duymuşdular. Dekabrın 26-da pedaqoji təcrübənin yekunlarına həsr edilmiş konfransa da elə bu duyğularla gəlmişdilər.



Konfransı giriş sözü ilə fakültənin dekanı, professor Buludxan Xəlilov açdı. Professor B.Xəlilov sabahın müəllimi olacaq yetirmələrini bu hissin təsirindən vücuduna dolan qürurla salamladı, onları ADPU-nun Filologiya fakültəsinin müəllimləri adından bu gün münasibətilə təbrik etdi.

Rəhbərlik etdiyi fakültədə həyata keçirilən hər hansı tədbiri bir qayda olaraq digərindən fərqli tərzdə təqdim edən professor B.Xəlilovun budəfəki təqdimat yönümü də özünəməxsusluğu ilə diqqət çəkdi: Pedaqoji təcrübədə daha fəal olan tələbələri bu dəfə "Dədə Qorqud" elmi-tədqiqat laboratoriyasının böyük elmi işçisi, hamımızın yaradıcılığını sevə-sevə oxuduğumuz, yaxınlarda 80 yaşını sevinc hissi ilə qeyd etdiyimiz şair Oqtay Rzanın "Baldan şirin balalar" toplusu ilə dəyərləndirmək qərarına gəlmişik. Fərqlənənlər üçün bu topluya ürək sözlərimizi də yazmışıq. İstəmişik ki, gələcəkdə şagirdləriniz qarşısında qürurlanasınız ki, ali təhsil illərində pedaqoji təcrübədə xüsusi fərqləndiyinizə görə bu şeirlər toplusu ilə mükafatlandırılmışsınız. Dərs deyəcəyiniz siniflərdə motivasiya quran zaman O.Rzanın bu kitabından da bəhrələnəsiniz. O.Rzanın, Z.Xəlilin və Azərbaycanın bir çox uşaq şairlərinin kitablarını nümayiş etdirməklə motivasiyanı praktik qurasınız".

Sonda pedaqoji təcrübə zamanı fərqlənən 22 tələbəyə Beynəlxalq Rəsul Rza, Mikayıl Müşfiq, Məmməd Araz, Cəfər Cabbarlı və "Qızıl qələm" mükafatları laureatı, Azərbaycan Yazıçılar Birliyinin və Azərbaycan Jurnalistlər Birliyinin üzvü Oqtay Rzanın "Baldan şirin balalar" kitabı hədiyyə edildi.

**Ayətxan ZİYAD**

# Azərbaycan alimlərinin I qurultayı keçirilib

**Dekabrın 19-da Azərbaycan Milli Elmlər Akademiyasının əsas binasında Azərbaycan alimlərinin I qurultayı keçirilib.Qurultay Azərbaycan Milli Elmlər Akademiyası (AMEA), Təhsil, Rabitə və Yüksək Texnologiyalar nazirlikləri tərəfindən birgə təşkil olunub.**

AzərTAc xəbər verir ki, qurultayda dövlət qurumlarının nümayəndələri, tanınmış alim və mütəxəssisləri, həmçinin dünyanın müxtəlif ölkələrində yaşayan azərbaycanlı alimlər iştirak ediblər.

İnternet üzərindən canlı yayımlanan tədbirdə çıxış edən AMEA-nın prezidenti, akademik Akif Əlizadə ilk dəfə keçirilən bu qurultayın müasir dünyanın qlobal çağırışlarının, Azərbaycanın sosial-iqtisadi və mədəni-mənəvi inkişafının, ölkə elmində gedən proseslərin məntiqi nəticəsi olduğunu bildirib. Qeyd edilib ki, ümummilli lider Heydər Əliyevin qurucusu olduğu müstəqil Azərbaycan onun ideyalarının və siyasi kursunun layiqli davamçısı Prezident İlham Əliyevin böyük uğurla həyata keçirdiyi siyasətin nəticəsində inkişafın keyfiyyətcə yeni mərhələsinə qədəm qoyub. Təqdirəlayiq haldır ki, Azərbaycanın milli sərvəti olan elmi potensialın qorunması, inkişaf etdirilməsi dövlət siyasətinin mühüm istiqamətlərindən birini təşkil edir.

Akademik vurğulayıb ki, hazırda elmi potensialın milli tərəqqi naminə maksimum dərəcədə səmərəli istifadə olunması Azərbaycan dövlətinin və cəmiyyətinin qarşısında duran əsas vəzifələrdən biridir.

Qurultayda Azərbaycan Prezidenti Administrasiyasının humanitar siyasət məsələləri şöbəsinin müdiri Fatma Abdullazadə Prezident İlham Əliyevin tədbir iştirakçılarına təbrik məktubunu oxuyub.

Sonra akademik Akif Əlizadə "Müasir dünyanın çağırışları və Azərbaycan elminin prioritetləri" mövzusunda məruzə ilə çıxış edib. Məruzəçi bildirib ki, elmin inkişaf tarixi bütün uğurlarımızın və nailiyyətlərimizin şəxsiyyət fenomeni ilə bağlı olduğunu göstərir. Milli birliyin, Azərbaycançılıq məfkurəsi ətrafında sıx birləşməyimizin əsasında da bir çox elmi amillər dayanır. Xalqımızın tarixini, qədim ənənələrini, zəngin mədəni irsini qoruyub saxlamağa, onların gələcək nəsillərə çatdırılmasına nail olmaq üçün humanitar elmlərin bütün spektrləri geniş vüsət almalıdır. Ölkəmizin təbii sərvətləri öyrənilmədən, elmə əsaslanan yeni texnologiyalar tətbiq olunmadan nə ekoloji təhlükəsizlik baxımından kənd təsərrüfatı inkişaf edə bilər, nə də bütövlükdə dövrün ekoloji çağırışlarına adekvat cavab verilə bilər.

Akademik A.Əlizadə deyib: "İnsan kapitalına daxil olan bütün amillər, o cümlədən əhalinin sağlamlığı yeni texnologiyalardan və elmi yanaşmalardan asılıdır. Hamımıza yaxşı bəllidir ki, həm orta, həm də ali təhsil möhkəm elmi bazaya söykənmədən, elmlə həmahəng inkişaf etmədən səmərəli fəaliyyət göstərə bilməz.

Bu gün ən böyük problem elmin qocalması və yüksəkixtisaslı gənc kadrların azlığıdır. Bizə lazım olan mütəxəssisi hələ orta məktəbdə itiririk, çünki gənclərin böyük qismi peşə seçimi problemi ilə rastlaşanda, öz gələcəyini elmlə və elmi fəaliyyətlə bağlamaq haqqında düşünmür. Hamımıza yaxşı məlum olan bu və ya digər problemlərin həlli üçün səylərimizi birləşdirməli, ümumi strategiyanın və fəaliyyət proqramının formalaşmasına nail olmalıyıq".

Məruzəçi daha sonra qeyd edib ki, ümummilli lider Heydər Əliyevin təşəbbüsü ilə fundamental elm sistemində başlanılmış islahatlar onun siyasi kursunun davamçısı



Prezident İlham Əliyev tərəfindən müasir dövrün tələblərinə uyğun surətdə inkişaf etdirilir, neft kapitalının insan kapitalına çevrilməsi istiqamətində ardıcıl tədbirlər həyata keçirilir. Milli sərvətimizin tükənməz hissəsi olan elmi potensialın qorunması, inkişaf etdirilməsi dövlət siyasətinin prioritet istiqamətlərindən biridir.

Prezident İlham Əliyevin elmin inkişafı ilə bağlı qəbul etdiyi çoxsaylı qərarlar sırasında "2009-2015-ci illərdə Azərbaycan Respublikasında elmin inkişafı üzrə Milli Strategiya", "Azərbaycan-2020: gələcəyə baxış" İnkişaf Konsepsiyası qəbul olunub, intellektual inkişaf modeli əsaslandırılıb və biliklər cəmiyyətinin qurulması ölkəmizin strateji inkişaf xətti kimi bəyan edilib.

Bu qərarlar ölkədə digər sahələrlə yanaşı, Azərbaycan elmi qarşısında da mühüm vəzifələr qoyub. Alimlərimiz öz qüvvələrini həmin vəzifələrin icrasına səfərbər edərək "Azərbaycan Milli Elmlər Akademiyası-2020" İnkişaf Konsepsiyasını işləyib hazırlayıblar. Konsepsiyada ölkənin elmi-texniki, innovativ inkişafının müasir, fəal sisteminin, eləcə də vətəndaş cəmiyyətinin və mədəniyyətin vacib amili olan sosial-iqtisadi dəyişikliklərin elmi əsaslarının yaradılması nəzərdə tutulur.

A.Əlizadə buna misal olaraq Azərbaycanda neft elmi, neft kimyası, nanotexnologiyalar və başqa sahələrdə elmlərin inkişaf proqramının hazırlanmasını göstərib. Vurğulayıb ki, müasir dünyada həyatın maddi əsasını müəyyən edən energetika, mexanika, informatika bu sahələrdə elmi tədqiqatların hərtərəfli dəstəklənməsinin zəruriliyini diktə edir.

XXI əsrdə cəmiyyət bioloji və tibb elmlərinin inkişafında daha çox maraqlıdır. Odur ki, alimlər canlı maddənin təbiəti və xüsusiyyətləri haqqındakı fundamental bilikləri genişləndirməli, tibb elminin, biotəbabətin, genetikanın, aqrar sahənin, həmçinin ekoloji təhlükəsizliyi və təbiətdən istifadənin inkişafını təmin etməyə nail olmalıdırlar.

"Elm və təhsilin inteqrasiyasının bəzi məsələləri haqqında" mövzusunda məruzəsində Təhsil naziri Mikayıl Cabbarov bildirib ki, bu gün qarşıda duran ən mühüm məsələ elm və təhsilin inteqrasiyasına nail olmaq, onların qarşılıqlı əlaqəsini gücləndirməkdir. Həmçinin ali təhsil müəssisələrində aparılan elmi tədqiqatların prioritetlərinin müəyyənləşdirilməsinin də vacib olduğunu vurğulayan nazir bu istiqamətdə zəruri tədbirlərin həyata keçirilməsinin nəzərdə tutulduğunu qeyd edib.

M.Cabbarov deyib ki, ümumtəhsil məktəblərində kurikulum proqramlarının hazırlanmasında elmi yanaşmalardan geniş istifadə olunacaq, həmçinin ali təhsil müəssisələrində elmi tədqiqatların genişləndirilməsi üçün maliyyə resurslarının müəyyənləşdirilməsi ilə bağlı tədbirlər həyata keçiriləcək. Hazırda ali təhsil müəssisələrindəki elmi fəaliyyəti əlaqələndirən müvafiq şuranın yaradılmasına və dünya səviyyəli elmi araşdırmaların çərçivə standartlarını müəyyənləşdirməyə ehtiyac duyulur.

İnnovativ inkişaf və müasir baxışlara dair məruzə ilə çıxış edən Rabitə və yüksək texnologiyalar naziri, akademik Əli Abbasov vurğulayıb ki, qurultayda müzakirə olunan məsələlər, irəli sürülən yeni ideyalar, qəbul edilən qərarlar elm və texnikanın, bütövlükdə iqtisadiyyatın gələcək inkişafı üçün çox önəmlidir. Azərbaycan alimləri ölkə iqtisadiyyatının müxtəlif sektorlarında birbaşa tətbiq oluna biləcək bir çox elmi nailiyyətlər əldə ediblər.

Akademik Əli Abbasov bildirib ki, qlobal rəqabət şəraitində respublikanın insan potensialının davamlı şəkildə yüksəldilməsi, gənc, yaradıcı, intellektual insanların istedadından maksimum istifadə edilməsi innovasiyalı inkişafın təmin olunması baxımından son dərəcə zəruridir. İKT, nanotexnologiyalar, kosmik, mikroelektronika, nüvə, biotexnologiyalar və digər elmi tutumlu sahələr üzrə kadr hazırlığı prioritet istiqamətlər hesab olunur.

Elmin inkişafı, onun səmərəliliyinin artırılması bir çox faktorlardan asılıdır. Bunun üçün maddi-texniki və informasiya bazası gücləndirilməli, gənc alim və mütəxəssislərə dəstək verilməli, onların xaricidə tanınmış elmi məktəblərdə təcrübə keçməsi, birgə tədqiqatların aparılması və intellektual mülkiyyətin qorunması da əsas şərtlərdəndir.

Nazir qeyd edib ki, qurultay elmin inkişafı ilə bağlı məsələlərin müzakirəsi, yeni fikirlərin ortaya çıxması üçün yaxşı bir platformadır.

Tədbirdə məşhur azərbaycanlı alim, ABŞ-ın Kaliforniya Berkli Universitetinin professoru Lütfi Zadənin, Avstraliya Federativ Universitetinin professoru Adil Bağırovun videomüraciətləri dinlənilib. Eyni zamanda dünyanın nüfuzlu alimlərinin və xarici ölkələrdə fəaliyyət göstərən azərbaycanlı alimlərin qurultaya ünvanladıqları təbriklər səsləndirilib.

Azərbaycan Respublikası Dövlət Neft Şirkətinin birinci vitse-prezidenti, akademik Xoşbəxt Yusifzadə, AMEA-nın Biologiya və Tibb Elmləri Bölməsinin akademik-katibi, akademik Əhliman Əmiraslanov, Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının rektoru, akademik Urxan Ələkbərov, AMEA-nın Naxçıvan Bölməsinin sədri, akademik İsmayıl Hacıyev, akademiklər Vasim Məmmədəliyev, Tofiq Hacıyev, İsmayıl İbrahimov, Fuad Əliyev, Ramiz Məmmədov Azərbaycan alimlərinin I qurultayı və onun əhəmiyyəti, elmin inkişafı və digər prioritet istiqamətlər barədə danışıblar. Qeyd olunub ki, Azərbaycanın akademik, təhsil, biznes və vətəndaş cəmiyyəti sektorlarında çalışan alim və tədqiqatçılar, o cümlədən xarici ölkələrdə yaşayan azərbaycanlı alimlər arasında qarşılıqlı münasibətləri inkişaf etdirmək və ümummilli əhəmiyyətə malik elmi problemlərin müzakirəsində ictimai konsensusa nail olmaq baxımından, eləcə də elmin bütün sahələri üzrə həmrəyliyin, qarşılıqlı əməkdaşlıq əlaqələrinin yaradılmasında qurultay böyük əhəmiyyətə malikdir.

Sonra Azərbaycan alimlərinin I qurultayının Bəyannaməsi qəbul olunub. Bəyannamədə son illər respublikanın müxtəlif sosial sferalarında İKT-nin geniş tətbiq olunduğu, informasiya cəmiyyətinin formalaşdığı qeyd edilir. Bu sahədə işlərin daha da inkişaf etdirilməsi üçün elm və təhsil şəbəkə infrastrukturlarının genişləndirilməsi, elmi informasiya resurslarının yaradılması, beynəlxalq elmi mühitə inteqrasiya və başqa istiqamətlərdə elmi tədqiqatların həyata keçirilməsinin zəruriliyi vurğulanır. Ümummilli lider Heydər Əliyevin "Azərbaycan Milli Elmlər Akademiyası haqqında" fərmanı imzaladığı günün - mayın 15-nin respublikada "Elm günü" kimi qeyd edilməsi ilə bağlı müvafiq dövlət orqanları qarşısında vəsatət qaldırılması məqsədəmüvafiq hesab olunur. Sənəddə elmin populyarlaşdırılması, elmi qurumların ictimaiyyətlə münasibətlərinin qurulması və digər aktual məsələlər də irəli sürülür.

Sonda qurultayın Azərbaycan Prezidenti İlham Əliyevə müraciəti oxundu.

# Bilik Fondu ADPU-da görüş keçirib

Məlum olduğu kimi, Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondu ali təhsil müəssisələrində görüşlərini davam etdirir. Dekabr ayının 1-də Bilik Fondunun icraçı direktoru Oqtay Səmədov və əməkdaşlar Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi, müəllim və tələbələri ilə görüşüblər.

ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev görüşü giriş sözü ilə açaraq Bilik Fondunun nümayəndələrini müəllim və tələbələrə təqdim edib. Professor Vilayət Əliyev bildirib ki, Bilik Fondunun universitetlərlə sıx əlaqələr qurması milli təhsil sistemimizin inkişafına və bütövlükdə cəmiyyətin maariflənməsinə böyük təkandır. O, təmsil etdiyi ali təhsil müəssisəsinin Bilik Fondunun layihələrində yaxından iştirak edəcəyini xüsusi qeyd edib.




Görüşdə Bilik Fondunun icraçı direktoru Oqtay Səmədov Fondun yaranması zərurətindən, strukturlarından və həyata keçirdiyi layihələrdən geniş söz açıb. Qısa müddət ərzində cəmiyyətin maarifləndirilməsinə xidmət edən layihələr barədə məlumatlar maraqla qarşılanıb. Görüşdə Bilik Fondunun fəaliyyətini əks etdirən film nümayiş etdirilib.

Sonda Bilik Fondunun əməkdaşları tədbir iştirakçılarının suallarını cavablandırıblar.

**Mətbuat və informasiya şöbəsi**

# ADPU-da Yeni il şənliyi

Dekabr ayının 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Həmkarlar İttifaqı Komitəsinin təşkilatçılığı ilə 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə şənlik keçirilmişdir. 2 hissədən ibarət olan Yeni il şənliyinin I hissəsi universitetin foyesində başlamışdır. Əvvəlcə Azərbaycan Dövlət Kukla Teatrının aktyorları uşaqları salamlamış, onları Yeni il münasibətilə təbrik etmiş, ən xoş, ən səmimi arzularını bildirmişlər. Sonra uşaqlar musiqi sədaları altında yolka ətrafında şeir, mahnı oxumuş, rəqs etmişlər. Yeni il şənliyinin personajları olan Şaxta baba və Qar qız uşaqları əyləndirmiş və onlarla birlikdə rəqs etmişdir.



Daha sonra Yeni il şənliyi ADPU-nun Böyük zalının səhnəsində davam etmişdir. Bu hissədə uşaqlar üçün "Leylək və tülkünün nağıl"ı tamaşası nümayiş etdirilmişdir.

Şənliyin sonunda uşaqlara hədiyyələr paylanılmışdır. Onu da qeyd edək ki, Yeni il şənliyi balacaların böyük sevincinə səbəb olmuşdur.

**Gülnar BƏXTİYARQIZI**

# ADPU-da “Təmiz şəhər” layihəsi çərçivəsində toplantı

Dekabr ayının 1-də ADPU-da “Təmiz şəhər” layihəsi çərçivəsində toplantı keçirilmişdir. Toplantıda “Təmiz şəhər” ASC-nin rəhbəri Sabit Zeyniyev, “Təbiət və həyat” qeyri-hökumət təşkilatının rəhbəri Fuad Axundzadə, “Səma və EKO” Elmi-Praktik İctimai Birliyinin nümayəndəsi İradə Həsənova, Milli Ekoloji Proqnozlaşdırma Mərkəzinin rəhbəri, texnika elmləri doktoru Telman Zeynalov və ADPU-nun Biologiya fakültəsinin müəllim və tələbələri iştirak etmişlər.

Toplantını giriş sözü ilə açan ADPU-nun Biologiya fakültəsinin dekanı, professor Yusif Əhmədov toplantı iştirakçılarını qonaqlarla tanış etmiş, çıxış üçün sözü universitetin Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyevə vermişdir.

Professor V.Əliyev bu sıradan toplantının ADPU-da ikinci dəfə keçirildiyini söyləmiş, belə bir toplantının ənənəvi olaraq hər il keçirilməsinin vacibliyini vurğulamış və əhəmiyyətindən söz açmışdır. “Kim təbiəti sevirsə, insanlığı sevir, insanlığı sevirsə, təbiəti sevir, onun daim yaşıllaşdırılmasına, bu yaşıllığın qorunub saxlanmasına xidmət göstərir”-deyən professor V.Əliyev çıxışında təkliflə də çıxış etmişdir: “Arzu edirəm ki, bu təşkilatların təşəbbüsü ilə gələcəkdə Biologiya fakültəsinin tələbələri də iştirak etməklə ekologiyanın qorunmasına xidmət edən tədbirlər, məsələn, iməciliklər, zooparka ekskursiyalar və digər tədbirlər həyata keçirilsin. Bu istiqamətdə maarifləndirmə işlərinin aparılması çox vacibdir. Qoy tələbələrimiz reallığı öz gözləri ilə görsünlər. Balaxanı ərazisinin əvvəlki görünüşü ilə indiki gözəlliyinin müşahidəçisi olsunlar. Fərqi dərk etsinlər.





Belə görüşlərin tələbələrin dünyagörüşünün formalaşmasında əhəmiyyətli rol oynadığını söyləyən professor V.Əliyev toplantının işinə uğur arzulamışdır.

Toplantıda Milli Ekoloji Proqramlaşdırma Mərkəzinin rəhbəri, texnika elmləri doktoru Telman Zeynalov və “Təmiz şəhər” ASC-nin rəhbəri Sabit Zeyniyev çıxış etmişlər.

Çıxışlarda bu istiqamətdə işlənən və həyata keçirilən layihələrdən söhbət açılmışdır. Məlum olmuşdur ki, “Təmiz şəhər” ASC Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 6 avqust 2008-ci il tarixli sərəncamı ilə yaradılmışdır. Yarandığı ilk gündən Bakının Balaxanı, Suraxanı və Qaradağ rayonları ASC-nin sərəncamına verilmiş və bu rayonların ərazisində şəhərin ətraf mühitinə mənfi təsir göstərən tullantı poliqonlarının bərpasına başlanmışdır.

Toplantı iştirakçılarına “Təmiz şəhər” layihəsinin əhəmiyyətindən bəhs edən maarifləndirici xarakterli iki buklet paylanmışdır. Toplantı iştirakçıları çıxışlardan və bukletlərdən bərk məişət tullantıları, onların növləri-təhlükəli və təhlükəsiz tullantılar, onların ətraf mühit üçün təhlükəlilik dərəcələri, “Təmiz şəhər” ASC-nin bu istiqamətdə gördüyü işlər barədə dolğun məlumat almışlar.

Sonda tələbələri maraqlandıran suallar cavablandırılmışdır.

**A.İSGƏNDƏROV**

# Pedaqoji təhsil: problemlər, qayğılar

## Müəllim peşəsi müqəddəs, şərəfli və gərəkli peşədir

Xalqımızın ümummilli lideri Heydər Əliyev təhsilə, elmə, məktəbə aid bütün çıxış və nitqlərində müəllim şəxsiyyətinə, müəllim əməyinə və cəmiyyətdə müəllimin roluna böyük dəyər vermiş, onları yüksək qiymətləndirmişdir: “Müəllim sənəti, peşəsi cəmiyyətdə yüksək qiymətə layiq olan bir peşədir. Müəllim olmaq kimi şərəfli bir iş yoxdur. Çünki müəllim xalqın elminin inkişaf etməsinin əsasını qoyanlardır”.

Müəllimlik əbədi və müqəddəs peşədir. Nə qədər ki cəmiyyət var, öyrətmək var - müəllimlik də vardır. Müəllim cəmiyyətin memarıdır. Cəmiyyətin gələcəyi məhz onun əli ilə qurulur. Buna görə də ilk növbədə təhsilimizin qarşısında duran başlıca vəzifələrdən biri və birincisi müəllim hazırlığına diqqətin artırılması, həqiqətən də, yüksək ixtisaslı müəllim hazırlığına nail olmaqdır.

O cəmiyyət güclü olur ki, onun müəllimi və təhsili güclü olsun. Müəllim savadlı, öz işini dərindən bilən, peşəsini və uşaqları sevən, öyrənmək və öyrətmək həvəsinə malik, işindən və peşəsindən zövq alan şəxs olarsa, onun yetişdirdiyi yeni nəsil də hazırlıqlı, hərtərəfli biliyə malik və vətənpərvər şəxslər olar.

Müəllim cəmiyyətin həyatında müstəsna rol oynayır. Ulu öndər Heydər Əliyevin dediyi kimi, “Əgər müəllim olmasa, heç birimiz cəmiyyətdə tutduğumuz yeri tuta bilməz və fəaliyyət göstərə bilmərik”. Buna görə də “...hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır”.

## Müəlimlik peşəsini seçənlərin bu peşəyə münasibətləri heç də nikbinlik yaratmır

Xalqımız müəllimlik peşəsini, müəllimi həmişə əziz tutmuş və Ulu Öndərin dediyi kimi, “Azərbaycanda müəllimə daim böyük hörmət olmuşdur. Müəllim cəmiyyətdə tanınan, hörmət edilən şəxs olmuşdur”. Hər il respublikamızın pedaqoji təmayülü ali və orta ixtisas məktəblərinə tələbə qəbulu planının yüksək səviyyədə yerinə yetirilməsini ilk növbədə bu hörmətin, müəllim peşəsinə olan ehtiramın nəticəsi və göstəricisi kimi qiymətləndirsək də, araşdırmalar göstərir ki, bu göstəricilər təkcə bunlarla bağlı deyildir.

Təəssüf hissi ilə qeyd etməliyik ki, bu gün pedaqoji sahəyə, konkret olaraq müəllimlik peşəsinə üz tutanların, heç də hamısı bu sahəyə sevdikləri, başqa sözlə, daxili tələbatlarının olduğu üçün onu gəlmirlər. Müşahidələr bu fikiri söyləməyə əsas verir ki, pedaqoji sahədə müvəffəqiyyətsizliyin əsas səbəblərindən biri və birincisi bu peşənin təsadüfi seçilməsi, peşə seçiminin düzgün edilməməsidir. Belə ki, peşə seçiminin düzgün edilməməsinin mənfi nəticələri həm pedaqoji təhsil müəssisələrində, həm də müəllimlərin pedaqoji fəaliyyətində özünü qabarıq şəkildə göstərir.

Bir qrup tələbə arasında “Mən nə üçün müəllimlik peşəsini seçdim” mövzusunda yazdırdığım inşa yazısı bu fikrimizin təsdiqi üçün səciyyəvidir. Yazıda 32 nəfər iştirak etmişdir. Respondentlərdən cəmi 1 nəfəri orta məktəbdə oxuyarkən müəllim peşəsini seçmək arzusunda olduğunu bildirmiş və ali məktəbə daxil olarkən ərizəsində birinci yerdə məhz bu peşə və ixtisası qeyd etmişdir. Tələbələrdən 23 nəfəri başqa peşə seçmək istədiklərini, lakin imtahan ballarına müvafiq olduğu üçün müəllimlik peşəsini seçdiyini, 9 nəfəri isə sadəcə ali təhsil almaq xətirinə burada oxuduqlarını bildirmişlər. Tələbələrdən 6 nəfərin burada oxumalarına peşiman olmadıqlarını, 2 nəfərinin isə ali təhsilini başa çatdırdıqdan sonra müəllim işləməyəcəklərini açıq etiraf etmələri təəssüf doğursa da, 10 nəfərin ADPU-da təhsil aldıqları bir il yarım müddətində onlarda bu sahəyə maraq yarandığı, gələcəkdə yaxşı müəllim kimi fəaliyyət göstərəcəklərini qeyd etmələri nikbinlik yaradır. Zənnimizcə, haqqında bəhs etdiyimiz tələbələrin müəllimlik peşəsinə adaptasiya olunmaları ADPU-da təhsilin günün tələblərinə cavab verən səviyyədə qurulduğunun təsdiqidir ki, bu hal alqışlanmağa layiqdir.

## Şagirdlər arasında da pedaqoji peşəyə maraq göstərənlər azdır

Ölkəmizdə gedən təhsil islahatları, xüsusən dövlət əhəmiyyətli bir neçə mühüm proqram və konsepsiyalar - “Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının konsepsiya və strategiyası”, “2011-2021-ci illərdə Azərbaycan təhsilinin inkişafı üzrə Milli Strategiya” və “Azərbaycan 2020: Gələcəyə Baxış” İnkişaf Konsepsiyası”ndan irəli gələn mühüm vəzifələr yeni pedaqoji təfəkkürə malik müəllimlərə ehtiyacı artırır. Cəmiyyət sözün geniş mənasında öz işinin əsl ustası olan, peşə və ixtisasına uşaqlara olan sevgini özünün fəaliyyətində birləşdirən, sənətinin vurğunu olan müəllimlərin çiynində dayandığından belə müəllimlərə daha çox ehtiyac hiss olunmaqdadır. Lakin pedaqoji işi seçim edən abituriyentlərin heç də hamısının bu sahəyə özünün qəlb istəyi ilə gəlməməsi ciddi narahatçılıqlar doğurur. Bunu şagirdlərlə apardığımız sorğuların nəticəsi də sübut edir.

Müşahidələr göstərir ki, məktəblilər arasında pedaqoji peşəyə maraq göstərənlərin sayı olduqca azdır. Bunun səbəblərindən biri müəllimlərin əməkhaqqının aşağı olmasıdırsa, ikinci səbəb məktəblərdə pedaqoji peşəyönümü üzrə işlərin aparılmamasıdır. Təəssüf doğuran haldır ki, bu gün pedaqoji yönümlü universitet və institut tələbələri arasında bir nəfər də olsun 600 və ondan yuxarı bal toplayan tələbə yoxdur.

Bakı şəhərindəki orta məktəblərin birinin IX sinfində 21 nəfər şagirdlə “Seçmək istədiyim peşə” mövzusunda apardığım inşa yazı hər iki amili təhlil etmək baxımından olduqca xarakterikdir. Cavabların təhlili göstərir ki, respondentlərdən yalnız bircə nəfər Azərbaycan dili və ədəbiyyatı müəllimi ixtisasını seçmək arzusunda olduğunu bildirmişdir. Öz seçiminin ana dilinə və uşaqlara olan sevgisi və onlarla işləməyə olan həvəsindən irəli gəldiyini əsaslandıran bu şagirddən fərqli olaraq digər şagirdlər hüquqşünas, iqtisadçı, polis işçisi, mühəndis peşələrini seçmək istədiklərini qeyd etmişlər.

Müşahidələr təsdiqləyir ki, valideynlərlə bərabər şagirdlərin bir qisminin, həm də böyük bir qisminin peşə planlarının müəyyənləşməsində əməkhaqqı amili heç də az rol oynamır. Xüsusən oğlanların müəllimlik peşəsinə üz tutmamalarının başlıca səbəbinin məhz əməkhaqqı ilə bağlı olduğu görünür. Lakin qızlar arasında da bu sahədə seçimin aşağı səviyyədə olması müşahidə olunur. Bu isə onu göstərir ki, məktəblərdə pedaqoji peşəyönümü heç də diqqət mərkəzində deyildir. Bunu başqa bir məktəbdə XI sinif şagirdləri ilə apardığım söhbət də təsdiq etdi. Alınan cavablar nə müəllimlərin, nə də valideynlərin gənclərlə pedaqoji peşəyönümü üzrə heç bir iş aparmadıqlarını üzə çıxardı.

## Pedaqoji peşənin nüfuzunu və şərəfini qorumaq lazımdır

Pedaqoji peşələrin seçimində bəzən məktəbəqədər yaşlardan - ailədən, bağçadan yaranan motivlər, bəzən də məktəbdə tədris prosesindən, fənlərin və müəllimlərin təsirindən yaranan motivlər özünü göstərir. Belə motivlər şəxsiyyətin sosiallaşmasında, seçilmiş peşənin həyat kredosuna çevrilməsində dominat rol oynayır. Müşahidələr göstərir ki, xüsusən aşağı siniflərdə müəllimin şəxsiyyəti, ümumi və peşə mədəniyyəti, hərəkət və davranışı, şagirdlərə öz övladları kimii yanaşma, münasibətlərindəki səmimilik, istilik, danışıq tərzi, geyimi, səliqəsi və s. şagirdlərə o dərəcədə güclü təsir göstərir ki, bunlar pedaqoji peşəseçiminin motivlərinə cevrilir. Şagirdlər müəllimlərindən hansına isə oxşamaq, onun kimi olmaq arzusunda olurlar. Burada müəllim peşəsinin sosial əhəmiyyəti, cəmiyyətdə yeri, şərəfli bir missyanı yerinə yetirməsi ilə bağlı şifahi şəkildə aparılan Işlərlə yanaşı, müəlimin nümunəsi də geniş təsir imkanlarına malik olur. Buna görə də, hər bir pedaqoq müəllim ləyaqətinə, müəllim nüfuzuna xələl gətirə biləcək heç bir sözə, hərəkətə yol verməməlidir. İxtisasından, hansı sinifdə dərs aparmasından asılı olmayaraq hər bir müəllim pedaqoji peşənin, müəllim sənətinin nüfuzunu, şərəfini qorumaq və yüksəltmək qayğısına qalmalıdır. Bu amillərin pedaqoji peşə marağının formalaşmasında mühüm təsir imkanlarına malik olduğunu unutmamalıdır. Əks halda, məktəblərimiz ali təhsil almaq üçün sənəd verən abituriyentlərin ərizələrində 10-15-ci yerlərdə pedaqoji təhsil ocaqlarını qeyd edən gələcək müəllimlərin hesabına komplektləşə bilər ki, bunun da nəticələrini təsəvvür etmək çətin deyildir. Lakin təcrübədə elə mənfi amillərə də rast gəlinir ki, onlar şagirdlərdə pedaqoji peşə maraqlarının yaranmasına olduqca əks təsir göstərir və onlarda bu peşənin sosial əhəmiyyətinin, gərəkliliyinin dərk edilməsinə maneçilik yaradır. Hətta bu amillər şagirdlərdə yaranmış maraqların sönməsinə də bilavasitə təsir göstərə bilir. Bunların səbəbkarı isə ilk növbədə müəllimlər özləri olurlar. Belə ki, bəzi müəllimlər şagirdlərin yanında müəllim əməyinin ağırlığından, indiki uşaqlarla işləməyin çətinliyindən, əməkhaqqının azlığından gileylənmələri, bəziləri isə öz hərəkət və davranışları, müəllim şəxsiyyəti ilə bir araya sığmayan danışıq və davranış tərzi ilə bu peşəni şagirdlərin gözlərindən salırlar. Belələri unudur ki, “Tərbiyəçi şəxsiyyətinin gənc ruha olan təsiri elə bir təsirdir ki, onu nə dərs kitabları, nə nəsihətlərlə, nə də mükafat və cəza sistemi ilə əvəz etmək olmaz” (K.D.Uşinski).

## Orta məktəblərdə kişi müəlimlərə ehtiyac çoxdur

Bu gün pedaqoji fakültələrdə oxuyan oğlanların sayı çox azdır. Orta məktəblərdə işləyən kişi müəllimlərin sayı isə qadın müəllimlərdən demək olar ki, 3 dəfə azdır (cəmi 23,7%). Bu da göstərir ki, müəllimlik peşələri üzrə ali təhsil almış gənclərimizin böyük bir hissəsi daha yüksək əməkhaqqı olan sahələrində çalışırlar. Bəs 4-5 illik dövlət vəsaiti, çəkilən zəhmət? Buna ən başlıca səbəb orta məktəblərin yalnız qadın müəllimlərdən ibarət olan bir müəssisəyə çevrilməsi, müəllim peşəsinin az qala qadın sənəti kimi status almasıdır”. Bunun hazırda nisbətən zəif nəzərə çarpan, lakin bunun getdikcə dərinləşən və genişlənən mənfi nəticəsini sonğunluğunu duymaq üçün heç də xüsusi təfəkkür sahibi olmaq lazım deyil.

Heç kəsə sirr deyildir ki, oğlanlarda mərdlik, qəhrəmanlıq, kişilik, iradə, dözüm, cəsarət kimi əxlaqi keyfiyyətlərin formalaşmasında atanın və kişi müəllimin rolu əvəzsizdir. Onların şəxsi nümunəsinin özü bir məktəbdir. Müşahidələr göstərir ki, məktəblərimizdə kişi müəllimlərin sayının getdikcə azalması nəinki təkcə oğlanların, qızların da tərbiyəsinə mənfi təsir göstərir. Orta məktəb illəri xarakterin formalaşmasında mühüm bir dövr olduğunu başqa sözlə aqil atalarımızın dediyi “Uşaq gördüyünü götürər” fikrini unutmamalıyıq, görkəmli rus pedaqoqu K.D.Uşinskinin söylədiyi “Xarakteri-xarakter yaradır” kimi həqiqəti yaddan çıxarmamalıyıq.

Həqiqətdir ki, bugünkü oğlanlar gələcəyin kişiləri - əsgərləri, Vətən qoruyucuları, ailə başçılarıdır. Onların “kişilik məktəbini” keçmələri üçün ailədə ata, məktəbdə kişi müəllimlər lazımdır. Qadın müəllimlərimizin əməyinə, zəhmətinə heç bir kölgə salmadan, fədakarlıqlarını yüksək qiymətləndirməklə yanaşı qeyd edim ki, məncə bu fikrimlə qadın müəllimlərin özləri də razılaşarlar məktəblərimizdə kişi müəllimlərin sayının və nüfuzunun artmasına həqiqətən də böyük ehtiyac vardır. İstər orta məktəbdə, istərsə də pedaqoji ali və orta ixtisas məktəblərində bu istiqamətdə ciddi dönüşə, mühüm addımlar atılmasına zərurət duyulur.

## Müəllimlik peşəsi üzrə peşəyönümü işlərinin gücləndirilməsi günün reallığıdır

Şagirdlərin pedaqoji peşə maraqlarının formalaşdırılmasında məktəbin üzərinə mühüm vəzifələr düşür. Bunlardan biri şagirdlərdə müəyyən olunmuş aparıcı peşə motivləri ilə gələcək fəaliyyət məqsədlərinin bir-biri ilə uyğunluq səviyyələrinin aşkara çıxarılmasıdır. Məktəb psixoloqu, sinif rəhbəri, fənn müəllimi bunu nəzərə alaraq müşahidə, müxtəlif sorğular, testlər vasitəsilə pedaqoji sahəyə maraq və qabiliyyəti olan şagirdləri müəyyənləşdirməli, onların gələcək fəaliyyət məqsədlərinin nələrdən ibarət olduğunu aydınlaşdırmalıdırlar. Bundan sonra aparıcı peşə motivləri ilə şagirdlərin gələcəkdə seçim edəcəkləri ixtisasa hansı dərəcədə uyğun olub-olmadığını müəyyənləşdirməli, son nəticədə bu uyğunluğa nail olmağa çalışmalıdırlar. Nəzərə alaq ki, təlim və dərsdənkənar məşğələlər bu prosesdə geniş imkanlara malikdir. Pedaqoji yönümlü dərnək məşğələləri, klublar təşkil etmək, şagirdləri maraqlı pedaqoji situasiyalarla qarşılaşdırmaq, “Əməkdar müəllim”lərlə, “İlin müəlimləri” ilə, qabaqçıl elm xadimləri və ali məktəb müəllimləri ilə görüşlər təşkil etmək, kiçik yaşlı şagirdlərlə işləməyə istiqamətləndirmək kimi tədbirlərdən istifadə etmək bu cəhətdən olduqca faydalıdır. Belə əlaqələr şagirdlərin pedaqoji peşələrə maraqlarının artması ilə yanaşı, onlarda müəllimlik peşəsinin mahiyyətinin düzgün dərk edilməsinə də əsaslı təsir göstərər.

### Nəticə

Orta təhsil müəssisələrimizdə güclü müəlimlər görmək istəyiriksə məktəb ən savadlı, ən ümidverici şagirdlərini məhz müəllim peşəsi seçməyə yönləndirməlidir. Orta və ali məktəblər müəllim hazırlığına maraqlı olmalı, pedaqoji peşəyönümü işləri məktəbin təlim-tərbiyə işlərinin tərkib hissəsinə çevrilməlidir. Gələcəyin peşəkar, öz işinin “ustası” olan müəllimlərini məhz orta məktəb partası arxasında əyləşən şagirdlər arasından və zamanında seçmək lazımdır. Hər bir yaxı müəllim öz əvəzedicisini hazırlamalıdır. Pedaqoji ali və orta ixtisas məktəblərində isə tələbələrin müəllim peşəsinə maraq və motivlərinin dərinləşməsinə və seçdikləri peşə və ixtisasa bağlanmalarına xüsusi diqqət yetirilməlidir. Həmçinin, pedaqoji sahə üzrə qəbul imtahanlarında qabiliyyət imtahanlarının olmasını da zəruri hesab edirik. Bu, yalnız ali təhsil almaq xatirinə pedaqoji ali məktəblərə daxil olanların qarşısını almaqla yanaşı, heç də bundan az zərərli olmayan bir nöqsanın - müəllimlik peşəsinə psixofizioloji cəhətdən yararlı olmayan şəxslərin daxil olmasının da qarşısını ala biləcəkdir. Nəticədə məktəblərimiz daha səriştəli, öz peşəsini sevən həqiqi müəllimlərlə komplektləşə bilər ki, bunun da faydasını zamanında cəmiyyətimiz görmüş olar.



**Müseyib İlyasov,**
**Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, pedaqogika üzrə elmlər doktoru**

# PEDAQOJİ FİKİR TARİXİMİZ VƏ PROFESSOR İRAMİN İSAYEV

**Müəllimim, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayevin "Pedaqoji irsimizdən: M.V.Vidadidən H.K.Sanılıyadək" (Bakı, ADPU, 2014) kitabını əlimə alanda ilk əvvəl böyük ədəbiyyatşünas alimimiz F.Köçərlinin sözləri yadıma düşdü. O, təxminən yüz il bundan əvvəl deyirdi: "Hərgah Vaqif və Vidadi kimi məşhur şairlər özgə millətlərin arasında zühur etsə idilər, bişübhə indiyə kimi onların asarü əşari dəfəat ilə çapdan çıxıb əbnayi-millət içində yayılmışdı. Onların qəbirləri üstündə nişangah qoyulmuşdu və vəfatlarının əlli və yüz sənəlik yubileyi - yövmü alisi artıq cəlal və təntənə ilə yad olunmuşdu.**

Amma bizim türklərdə bu hissiyyat və qədirşünaslıq yoxdur. Şan və şərafətimizə, Vətən və millətimizin sərəfrazlığına səbəb olan, dilimiz və ədəbiyyatımıza rövnəq verən əziz və möhtərəm vücudların qədr və mənzilətini bilmirik və onların asari-küzidələri ilə iftixar etmirik. Əzbəs ki, avamıq və avamlığımızdan milliyyət hissi bizlərdə ayılmayıbdır, millətimizin, Vətənimizin və dilimizin və ədəbiyyatımızın qədrini bilmirik". Etiraf edək ki, bu sözlərin üzərindən yüz il keçməsinə baxmayaraq, hələ də bir nəticə çıxara bilmirik. Ancaq sevindirici və sevinməli, örnək olası məsələlər və məqamlar da çoxdur. Son dövr ictimai-mədəni mühitdə lazımi qədər uğurlu nümunələr, gərəkli işlər görülür. Professor İramin İsayevin "Pedaqoji irsimizdən: M.V.Vidadidən H.K.Sanılıyadək" adlı kitabı həmin uğurlardandır. Qeyd edək ki, bu kitabın elmi redaktoru, pedaqogika üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi Fərrux Rüstəmovdur. Fikrimcə və həyat təcrübəmin diktəsinə görə ən böyük mükafatlar xalqdan gəlir. Elə böyük abidələri də xalqın arasından çıxanlar yaradır. Professor İ.İsayevin klassiklərimiz, ədəbiyyatımızın, mədəniyyətimizin keşiyində duran və bütün varlığı ilə məmləkətin çiçəklənməsinə çalışan, ömrünü xalq, millət yolunda şama döndərən ədiblərimizin haqqında yazdıqlarını oxuduqdan sonar fikirlərimi bölüşmək ehtiyacı duydum və ağlıma ilk əvvəl gələnlər bunlar oldu.

Mənim müəllimlərim haqqında düşüncələrimi, hisslərimi yazıya gətirmək çətinliyim olubdu. Bu, pedaqoji fakir tariximizi bizlərə sistemli şəkildə mənimsədən, xalqın milli-mənəvi mədəniyyət qaynaqlarını böyük şövq, həvəslə öyrədən professor İ.İsayevdə də belə oldu. Özlüyümdə səbəbləri haqqında çox düşünmüşəm. Son gəldiyim qənaət, müəllimlərimin böyüklüyü müqabilində hansısa yazını yaza bilib-bilməməyimin narahatçılığı kimi anladım. Ancaq yazmışam, hansısa bir ilahi güc, hiss qənaətlərimi bölüşməyə imkan yaradıb. Onu da deyim ki, mənim mənəvi zənginlik, ucalıq, xalq, millət sevgisi timsalında böyük-böyük müəllimlərim olubdur. Xalq yazıçısı, görkəmli pedaqoq İ.Şıxlı, professor P.Əfəndiyev, professor M.Həkimov, professor A.Hacıyev, professor M.Məmmədov, professor X.Məmmədov, professor M.Mustafayev, professor H.Qasımov, professor N.Xudiyev, professor M.Balayev, dosent A.Hüseynov, dosent İ.Mustafayev, dosent K.Tarverdiyeva, dosent Z.Rəsulov, dosent Z.Tahirli və başqaları buna nümunədir. Onların bir hissəsi dünyasını dəyişib, haqq dünyasındadır. Allah onlara rəhmət eləsin! Digər bir hissəsi öz böyük işləri ilə xalqımıza, elmimizə töhfələrini verməkdə davam edirlər. Keçən əsrin səksəninci illərinin əvvəlində elmin sirlərini, həyatı, insanlara, dünyaya münasibəti onlardan öyrənmişəm. Bütün öyrəndiklərim üçün özümü onlara borclu bilirəm. Onlar sözün həqiqi mənasında böyük müəllimlərdir. Bir zamanlar həmin böyüklüyün duyğusunu, hissini tələbə kimi yaşamışam. Bu gün onlarla bir yerdəyəm, müəllim kimi onlarla birgə fəaliyyət göstərirəm. Onlardan yenə də öyrənirəm - münasibəti, səmimiyyəti, xeyirxahlığı, Vətən, torpaq sevgisini öyrənirəm. Bu gün də onlar mənim üçün müəllimdirlər, nümunədirlər böyükdürlər. Tələbəlik illərimin, yaddaşımın qənaətləri çevrəsindəyəm. Professor İ.İsayev də məhz onlardan biridir.

Yuxarıda müəllim kimi indi onlarla bir yerdəyəm ifadəsini işlətdim. Harada dayanmağımdan, nələrlə göründüyümdən asılı olmayaraq, mən yenə də özümü onların yanında həmin illərin tələbəsi düşüncəsindən uzaqlaşdıra bilmirəm. Və son olaraq elə həmin tələbə kimi də söhbətləşirəm. Professor İ.İsayev bizə "Pedaqogika tarixi" fənnindən mühazirələr oxuyurdu. Onun böyük şövq və olmazın dərəcədə sonsuz sevgi ilə oxuduğu mühazirələr bu gün də tələbə yoldaşlarımızla söhbətlərimizin bir hissəsidir. O sevginin qaynaqlarını, ilhamının mayasını "Pedaqoji irsimizdən: M.V.Vidadidən H.K.Sanılıyadək" adlı kitabında gördüm. Onu da gördüm ki, bu müəllimlərim M.V.Vidadidən, M.P.Vaqifdən, Q.Zakirdən, S.Ə.Şirvanidən, S.S.Axundovdan, M.Mahmudbəyovdan, S.M.Qənizadədən, A.Səhhətdən, A.Şaiqdən, H.K.Sanılıdan və digərlərindən başlayan yolun davamçılarıdırlar. Bütün gileylərə, narazılıqlara baxmayaraq, qürurlanmalı bir məsələ var ki, bu da böyük yolun (müəyyənləşmiş yolun) olması və onu sabahlara aparanların varlığıdır. Kitabdakı epiqrafda deyilir: "Xalq daim gərək öz kökünü xatırlasın, tarixini öyrənsin, milli mədəniyyətindən, elmindən heç vaxt ayrılmasın". Bu söz ulu öndərimiz Heydər Əliyevə məxsusdur. Bu epiqraf bütünlükdə kitabın mahiyyətini, səhifələrində nələrin olmasını, müəllifin nələr haqqında düşünməsini, elmimizə, ədəbiyyatımıza, millətimizə sevgisini işarələyir. Müəlimimin də bu duyğular üzərində təkrarən kökləndiyini bir daha ortaya qoyur. Onsuz da pedaqoq alimimiz bütün tərəfləri ilə nümunə olmağa, ideallarla yaşamağa köklənənlərdəndir.




Görkəmli pedaqoqumuz Ə.Seyidov vurğulayır ki, xalq yaradıcılığı nümunələri digər xalqlarda olduğu kimi, Azərbaycan xalq pedaqogikasının ilk müjdəçisidir. Klassiklərimiz poeziyanı xalqın ilk müəllimi adlandırmışlar. Doğurdan da, belədir. Bayatılarımız, nəğmələrimiz, atalar sözü və məsəllərimiz, mahnılarımız, nağıl, əfsanə, rəvayət, dastan örnəklərimiz sözün həqiqi mənasında xalq pedaqogikamızın ilk müjdəçiləridir. Onların hər birisi bir mənəviyyat, ədəb-ərkan, əxlaq nümunəsidir. Xalqımızın söz tarixidir. Bizim yaddaşımızdır, ulularımızın, bizdən qabaqkıların daxilinin, mənəviyyatının ifadəsidir. Azərbaycan pedaqoji fikir tarixinin öyrənilməsində klassiklərimizin yaradıcılığı mühüm mərhələdir. Klassik ədəbiyyatın görkəmli nümayəndələrinin əsərləri, yaratdığı abidələr xalqımızın keçib gəldiyi yolun tarixini, məqsəd və məramını, mənəvi aləmini özündə bütün tərəfləri ilə ehtiva edən mənbələrdəndir. Pedaqoq-alimimiz İ.İsayevin isə pedaqoji fikir tariximizin mühüm bir hissəsinə diqqət yetirməsi və XVIII əsr mərhələsindən bu yana olan hissəsini araşdırma probleminə çevirməsi təsadüfi deyildir. Kitabın adında iki böyük şəxsin - M.V.Vidadinin və H.K.Sanılının adı qeyd olunur. Ilk olaraq onu deyim və təəssüflər olsun ki, nə M.V.Vidadinin, nə də H.K.Sanılının yaradıcılığını problem kimi lazımi qədər araşdıra bilməmişik. M.P.Vaqifin də ədəbi irsini hələ ədəbi-nəzəri fikir lazımınca araşdırıb qiymətini verə bilməmişdir. Düzdür, onların (M.V.Vidadinin, M.P.Vaqifin, Q.Zakirin) yaradıcılığı, ədəbi irsinin toplanıb nəşr olunması tarixi xeyli əvvəllərə, təxminən XIX əsrin ortalarına gedib çıxır. Mirzə Yusif, Adolf Berje, Məmmədağa Müctəhidzadə, Mir Möhsün Nəvvab, Hüseyn Əfəndi Qaibov, Salman Mümtaz, Firudin bəy Köçərli, Həmid Araslı və başqaları günümüzə qədər müxtəlif səpkili fikirlər söyləmişlər. Ancaq təəssüflərdirici odur ki, bu iki böyük şairimiz (M.V.Vidadi və M.P.Vaqif) elə də sistemli təhlillərin probleminə çevrilməmişdir.

M.V.Vidadi və M.P.Vaqif Azərbaycan ədəbiyyatı tarixində mərhələdir. Bunu ədəbi-nəzəri fikrin görkəmli nümayəndələri müxtəlif səpkili yazılarında, apardığı təhlillərdə dönə-dönə təkrarlamışlar. Həqiqətdə də belədir. On ildən, əlli ildən, yüz ildən sonrakı ədəbi-nəzəri fikrin qənaətində də belə olacaqdır. Ancaq mərhələ olmanın, Vidadi və Vaqif poeziyasının poetik strukturunun nələrlə ehtiva olunduğunun elmi-nəzəri mahiyyəti konseptual səviyyədə, deyilənlər müstəvisində hələ açılmır. M.V.Vidadi, M.P.Vaqif türk şeir ənənəsində Y.Əmrədən, Qurbanidən və Ş.İ.Xətaidən sonranın müqayisəolunmaz nümayəndəsidir. Zaman-zaman klassik ənənədə, əruz vəznində fars və ərəb dilində yazmaya ən böyük zərbəni xalq şeiri üslubunda yazması və bütünlükdə böyük istedadı ilə nümunə olmaqla Vidadi və Vaqif vurdu. Xalq şeiri üslubunun qüdrət və imkanlarını nümayiş etdirdi. Azərbaycan poeziyasının bütünlükdə gələcək yolunu müəyyənləşdirdi. Bu, Azərbaycan musiqisinin, qopuzun, sazın, türklük düşüncəsinin öləzidilmiş ruhunun oyadılması idi. Q.Zakir, Aşıq Ələsgər, S.Vurğun, H.Arif və digərləri M.V.Vidadi və M.P.Vaqifdən sonrakı ruhun düşüncə qaynaqlarıdır. Professor İ.İsayevin məhz bu müstəvidə klassiklərimizin yaradıcılığını tədqiqat obyektinə çevirməsi və məsələyə pedaqoji fakir tariximiz kontekstində yanaşması olduqca uğurlu, həm də əğlabatandır. Tədqiqatçı alimimiz çox doğru olaraq vurğulayır: "Molla Vəli Vidadi klassik sənətkarlarımız arasında ədəbi-bədii irsi az tədqiq olunan şairlərdən biridir. Onun irsi əsrlərin dolaylarından keçərək tam şəkildə bizə gəlib çatmamışdır. Ağır çəkişmələr, vuruşmalar, dağıntılar və hərc-mərclik dövründə yaşayan şairin şeirləri küll halında qalmamış, hafizələrdə yaşamış, bəzi cünglərdə mühafizə olunmuşdur. Əldə olan 55 şeiri və 3 müsibətnaməsi onun yaradıcılığının böyüklüyündən, zənginliyindən və "qeyri-adi orijinal istedada malik olması"ndan (F.Köçərli) soraq verir". M.V.Vidadi poeziyasında M.P.Vaqif, Ağqız oğlu Piri, Sarı Çobanoğlu ilə şeirləşmələri (deyişmələri), "Durnalar" şeiri və s. Azərbaycan ədəbiyyatının klassik nümunələridir.

"İctimai duyğu və düşüncələrin ifadəsinə çevrilmiş Vidadi lirikasında əsas diqqət şəxsiyyətin zahiri aləminə, taleyinə, keçirdiyi psixoloji vəziyyətin təsvirinə verilmiş, şəxsiyyətin mənəvi inkişafında buxova çevrilmiş amillərin, ətraf mühitin eybəcərliklərinin tənqidinə həsr olunmuşdur" (s.21). XVIII əsr Azərbaycan poeziyasının mahiyyətinə, ictimai-siyasi mühitin ümumi spektrlərinə nəzər saldıqda mətn hadisəsi kimi M.V.Vidadi yaradıcılığı etnosun yaddaşını, əxlaq kodeksinin estetik, sosioloji mənzərəsini ifadə edir. Əlbəttə, bunların tam təfərrüatlı aydınlığı üçün M.P.Vaqif və Q.Zakir yaradıcılığını ideya, enerji qaynaqları, syasi-ictimai sferanın estetik düşüncə təmayüllərinin ifadəsi müstəvisində təhlillərdən keçirmək, mövcud istiqamətlərin mahiyyətinə işıq tutmaq lazımdır. Çox doğru olaraq təhlilərdə Vidadi kədəri ictimai müstəvidə tədqiqat obyektinə çevrilir. Çünki M.M.Vidadi kimi sənətkarların yaradıcılığı düşüncə hadisəsi kimi fərdilikdə dayanmır. Onun mahiyyətində mühitdən, siyasi münasibətlərin izdivacından, zamanın doğurduğu problemlərdən, orta əsrlərin əndazədən çıxan mənəmmənəmlikləri baş qaldırır. O halda məsələlərə XVIII əsrin hadisələri, ictimai, siyasi, mədəni mühiti səviyyəsində baxanda bunun ağırlıqlarını və Vidadi kədərinin mahiyyətini dərk etməyə yaxınlaşmış oluruq. "Hər kimin ki, mövla olsa köməyi, nə işi var sultan ilə xan ilə", "Vidadiyəm, təbib dərman bağlamaz", "yad yığılar, sərin baxar, ağlamaz", "gər aqil isən, gərdişi-dövranə inanma", "bir cam yetir, saqi, bu dövran belə qalmaz" və s. kimi düşüncələr mühitə və cəmiyyətə ünvanlanmış misralardır. Pedaqoji fikir tariximiz müstəvisində M.V.Vidadi, M.P.Vaqif və Q.Zakirlə bağlı deyilənlər bu böyük sənətkarların yaradıcılığı timsalında bir istiqamətdir. Bu sənətkarlar firkin, düşüncənin aydınlığında bizim üçün hələ də açılmamış mücrüdür. Mətn tipi, mətn hadisəsi kimi onların yaradıcılığının tipoloji müstəvidə mahiyyəti hələ çox gizlinləri işarələyir. Professor İ.İsayev məhz bu klassik sənətkarların ədəbi irsini pedaqoji fikir tarixi müstəvisində təhlilə cəlb etmiş və onların yaradıcılığı kontekstində düşüncələrinin bədii-estetik sərhədlərini cızmışdır.

XX əsr Azərbaycan poeziyasında, ictimai-mədəni düşüncəsində özünəməxsus yeri olan, "şişəyə çəksəz də diriykən ətimi, atmaram mən vətəni-millətimi" deyən Abbas Səhətin yaradıcılığı təsadüfi pedaqoq alimimizin diqqətini cəlb etməmişdir. "Yaşlı nəsildə heç bir ictimai-siyasi dünyabaxış yarada bilməyən edib üzünü gənc nəslə tutur, həyatını, fəaliyyətini, yaradıcılıq axtarışlarını kiçik yaşlı uşaqlara həsr etmiş olduğu əsərlərdə araşdırır. Lirik şeirləri, dramatik əsərləri, təmsil və alleqorik sənət inciləri ilə yeni nəsildə ruhu oxşayan: ailəyə, anaya, insana, cəmiyyətə, xalqa, millətə, Vətənə və s. məhəbbət hissi aşılayırdı. "Yaz", "Bağça", "Ana və bala" ,"Quşlar", "Bahar", "Vətən", "Məktəb şagirdi" və s. onlarla poetik nümunələr bu hisslərlə dolu yaranmışdır" (səh. 105). Elə pedaqoji fakir tariximizin istedadlı tədqiqatçısı İ.İsayev də bunları təhlil etməklə eyni ideallarda, vətən, yurd sevgisinin sonsuzluğunda görünür və özünü də bu ideallar timsalında həmin klassiklərin cərgəsinə qoşur. A.Səhhətin zəngin və çoxşaxəli yaradıcılığı timsalında XX əsrin ilk onilliklərinin ümumi mənzərəsi ortaya qoyulur. Çünki professor İ.İsayevin qənaətləri, faktlara bələdliyi, bütün onları çox incəliklərinə qədər qiymətləndirə bilməsi onun uzun illərki araşdırmasının yekunudur. XX əsr bütün müstəvilərdə Azərbaycan ədəbiyyatı, elmi, mədəniyyəti müstəvisində uğurlarla xarakterizə olunur. Mühitlərin zənginliyi, ideoloji mübarizələrin, milli düşüncənin, pedaqoji firkin əhatəliliyi və tipologiyası anlamında XX əsrin ilk onilliklərinin yeri müstəsnalıqdır. H.Zərdabinin, S.M.Qənizadənin, M.Mahmudbəyovun, E.Sultanovun, A.Şaiqin, Y.V.Çəmənzəminlinin, R.Əfəndiyevin, S.S.Axundovun, Ü.Hacıbəylinin, C.Məmmədquluzadənin, M.Ə.Sabirin, S.Mümtazın, H.Zeynallının, V.Xuluflunun, S.Hüseynin, Ə.Nazimin və başqalarının fəaliyyət göstərdiyi bu zamanın fikir sərhədləri hüdudsuzluğa, türkün cahanşümul ideyalarına hesablanır. Onların hər birisinin, daha doğrusu, böyük əksəriyyətinin taleyində otuz yeddinci ilin ağrısı vardır. Bu isə milli düşüncəyə, etnosun genetik yaddaşına qarşı atılmış addım idi. Hacı Kərim Sanılı da bu sırada eyni aqibəti, taleni yaşayırdı. Azərbaycan ədəbi-bədii və pedaqoji fikir tarixində öz yeri olan H.K.Sanılı ziddiyyətlərlə dolu bir ömür yaşamışdır. Rus çarizminin təqibləri, sonrakı mərhələdə milli hökumətdəki vəziyyəti, sovetlər dönəmindəki ziddiyyətli, ağrı və gərginliklərlə dolu həyatı onun bir istiqamətdə cəmiyyətin özündən gələn qüsurlarla barışmazlığı ilə bağlanır. Təbiətindəki mübarizlik, xalqın xoş gələcəyi naminə apardığı çarpışmalar son olaraq otuz yeddinci ilin repressiyasına zərurətə çevirdi. Professor İ.İsayev "Pedaqoji irsimizdən: M.V.Vidadidən H.K.Sanılıyadək" adlı monoqrafiyasında H.K.Sanılının həyat və yaradıcılığını müxtəlif istiqamətlərdə tədqiqata cəlb etmiş, onun ədəbi-bədii irsi, pedaqoji fəaliyyəti haqqında dolğun təsəvvür yaratmışdır. "Hacı Kərim Sanılının həyatı və pedaqoji fəaliyyəti", "Hacı Kərim Sanılı: təlimin ümumi məsələləri haqqında", "Hacı Kərim Sanılının proqram və dərslikləri", "Hacı Kərim Sanılının əsərlərində tərbiyə məsələləri", "Əxlaq məsələləri" başlıqları altında aparılan təhlillər müəllifin probleme geniş müstəvidə yanaşmasını təsdiqləyir. Məsələ bununla da bitmir, eyni zamanda daha geniş araşdırmaları aktuallaşdırır. Bütün bunlar son olaraq onu deməyə əsas verir ki, çağdaş elmi sferada, nəzəri-pedaqoji düşüncədə xalqın, millətin mənəviyyat qaynaqlarının müəyyənləşməsi və araşdırılması istiqamətində hələ görüləsi çox işlərimiz vardır.

**Mahmud ALLAHMANLI,**
**Azərbaycan ədəbiyyatı tarixi kafedrasının professoru, filologiya üzrə elmlər doktoru, B.Çobanzadə adına Ukrayna Respublika mükafatı laureatı**

# Ulu öndər Heydər Əliyevin xatirəsinə həsr edilmiş voleybol çempionatı



Dekabr ayının 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının və Tələbə Həmkarlar İttifaqının (THİ) birgə təşkilatçılığı və Səbail Rayon Gənclər və İdman İdarəsinin təşkilati dəstəyi ilə ümummilli lider Heydər Əliyevin anım gününə həsr edilmiş qızlar arasında keçirilən voleybol çempionatı başa çatdı. Məlumat üçün bildirək ki, 3 həftə davam edən yarışda 3 qrupda bütövlükdə 14 komanda mübarizə aparmışdır. Final mərhələsinin nəticələrinə əsasən 1-ci yerə Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin komandası, 2-ci yerə Tarix fakültəsinin komandası, 3-cü yerə isə Kimya fakültəsinin komandası layiq görüldülər.Yarışın sonunda qalib gəlmiş komandalar diplom, kubok və medallarla mükafatlandırıldılar. Biz də qalib komandaları təbrik edir, uğurlar arzulayırıq.

.Eyni zamanda voleybol yarışının keçirilməsində bizə dəstək verən Tələbə İdman Klubunun rəhbəri, dosent Gülbaba Quliyevə və oyuna hakimlik edən Şərif Allahquluyevə öz təşükkürümüzü bildirik .

**Ramid Seyfullayev,**
**Pedaqogika və psixologiya fakültəsinin II kurs tələbəsi, TGT-nin fakültə sədri**

## Müəllim

Nə qədər ucadır müəllim adı,
Zülmətdə parlayan işığa bənzər.
Ona yaraşıqdır elmi, savadı,
Şöhrəti, hörməti dünyanı gəzər.

Həkimin, hakimin, cümlə alimin
Sənəti yolunda müəllim dayanır.
İşıqlı həyatın, sonsuz aləmin
Sabahı, keçmişi nura boyanır.

Bu elə sənətdir, naşını sevməz
Cəfakeş olana minnətdar olar.
Təsadüf gələn də bir gün görünməz,
Bu da onun üçün böyük ar olar.

Könül bulandıran hər milçəyə də
Kara da, kora da müəllim deyirik.
İmkan sahibinə, alverçiyə də,
Bəzən quldura da müəllim deyirik.

Yoxmu başqa bir ad hörmət naminə?
Hər kəsi müəllim adlandırmayaq!
Ehtiram göstərib, şöhrət naminə,
Onun saf adını bulandırmayaq.

## Bəzən

Heç zaman "mən" demə, mənliyin sınar,
"Mənəm" deyənlərin axırı yoxdur.
Hərə bir biçimdə can fəda edir,
Mənə ürək göstər, paxırı yoxdur.

Həyat nə pislikçün, nə yaxşılıqçün,
Bir yuva deyil ki, havasın alaq.
Yaltaqlıq məddahı məst edir ancaq,
Biz də yaxşılığın qeydinə qalaq.

Ayıq ol, güvənmə təravətinə,
Canda təravət də qonaq kimidir.
Zor ilə ölçülmür dünyada heç nə,
Bəzən məharət də sınaq kimidir.



**Rəşad Mahmudoğlu,**
**Filologiya fakültəsinin qiyabi şöbəsinin IV tədris ilinin 401-ci qrup tələbəsi**

# Kitabxanamız zənginləşir

1.A.Ə. Sadıqova,Ə.F.Quliyev. "Elektrotexnika" I hissə(Dərs vəsaiti).B., 2014, 192 səh Dərs vəsaitində elektrotexnikanın fiziki əsaslarına dair müfəssəl nəzəri məlumatlar verilmişdir.

2.A.C.Adıgözəlov,S.M.Nəcəfova."Ali riyaziyyatdan məsələ və misallar həlli"(Qeyri -ixtisas fakültələr üçün).Ali məktəblər üçün dərs vəsaiti.B., 2014, 169 səh. Dərs vəsaiti ali riyaziyyat kursunun bölmələrinə aid məsələ və misallar həllinə həsr olunmuşdur.

3.Zaman Məmmədov."Riyaziyyatdan ibtidai sinif müəllimlərinə kömək"(Metodik vəsait).B., 2014, 175 səh.

Vəsaitdə yeni təhsil islahatı proqramına tələbləri baxımından ibtidai siniflərdə riyaziyyat fənninin tədrisi metodikasının praktiki əhəmiyyətindən,xüsusilə hesab əməllərinin asan və sadə yollarla öyrədilməsi üsullarından danışılır.

4.K.Ə.Cəlilov,V.Y.Məstəliyev,S.Z.Əhmədov."İnteqral tənliklər"(Dərs vəsaiti).B., 2011, 95 səh.

5.Korrupsiyaya qarşı mübarizəyə dair normativ hüquqi aktlar.Qanunlar,Fərman-lar,Sərəncamlar,Beynəlxalq müqavilələr,Qərarlar,Əmrlər,Məlumatlar.B.,2009, 440 səh.

Bu toplu Azərbaycan Respublikasının Korrupsiyaya Qarşı Mübarizə üzrə Komissiyası tərəfindən hazırlanmışdır.

6.Əli Şamil.(Əli Hüseyn oğlu Şamilov)."Colan Türkmanları" (folklor və etnoqrafiya örnəkləri).B.,"Elm və təhsil" nəşriyyatı, 2014, 142 səh.

Kitabda Suriyanın Colan bölgəsində (indi bu bölgənin çoxu İsrail işğalı altındadır)yaşayan soydaşlarımızın-türkmanların taleyindən,onların tarixindən və adət-ənənələrindən söz açılır.

7.Elmira Axundova."Sabahımızı düşünərək" (rus dilində).B., "CBS", 2014, 304 səh.

8.Alxan Bayramoğlu."Müxtəsər Azərbaycan ədəbiyyatı tarixi oçerki" (Qədim dövrdən 1930-cu illərədək).B., "Elm və təhsil" nəşriyyatı, 2013, 200 səh.

Alxan Bayramoğlunun (Məmmədovun)çoxillik elmi araşdırmalarının və tədris-metodiki fəaliyyətinin nəticəsi kimi üzə çıxan bu kitabda milli ədəbi ictimai fikrin qədim(İslam xilafətindən əvvəl)dövrdən 1930-cu illərə kimi olan dövrünün ədəbi şəxsiyyətləri,abidələri,düşüncə və yaradıcılıq istiqamətləri izlənilmiş,onlara münasibət bildirilmişdir.

9.Ənvər Seyidov."Heydər Əliyev və Azərbaycan Respublikasının Konstitusiyası" (Dərs vəsaiti).B.,2014, 405 səh.

10.Yaqub Mahmudov."Azərbaycan tarixi".Erkən intibah dövrü(IX əsrin ikinci yarısı-XIII əsrin əvvəlləri).B., "Aspoliqraf", 2008, 128 səh.

Kitabda Ərəb xilafətinin süqutundan sonra Azərbaycanda yerli dövlətlərin yaranması ilə başlanmış siyasi,iqtisadi və mədəni dirçəlişdən bəhs olunur.

11.H.M.Hacıyeva, F.M.Orucov, O.Q.Qafarova,A.A.Axundova."Həyat bilgisinin əsasları".(Ali məktəbin bakalavriat pilləsi üçün dərslik). B., "Elm", 2014, 240 səh.

12.E.M.Quliyev."Uşaq psixologiyası".(Testlər-530). B., 2013, 148 səh.

13.Nəbiyeva Cəmalə Oruc qızı."İnformatikanın praktiki əsasları".(Ali məktəb tələbələri üçün dərs vəsaiti).B., "ADPU"-nəşriyyatı, 2014, 147 səh.

14.M.İ.Murquzov,A.S.Ələkbərov,C.M.Səfərov."Fiziki elektronikadan laboratoriya praktikumu"(Yenilənmiş təkrar nəşr). B., "MBM", 2013, 128 səh.

Vəsaitdə fiziki elektronikanın bütün sahələrini əhatə edən on bir laboratoriya işi ali məktəblərin bakalavriat pilləsinə uyğun tərtib edilmişdir.

15.Rəftar Cəliloğlu,M.A.Pənahi."XIII əsrin 90-cı illərində Qarabağ əhalisinin yadelli işğalçılara qarşı mübarizəsi tarixindən".("Azərbaycan tarixi"üzrə bakalavriat pilləsi üçün tədris-metodik vəsait). B., 2012, 90 səh.

Olduqca yığcam şəkildə hazırlanmış bu kitab əsrlər boyu parçalanan, bu gün də düşmən tapdağı altında qalan,öz doğma yurdlarından didərgin düşən və sakinlərini səbirsizliklə gözləyən ulu yurdumuz-Qarabağ xanlığının paytaxtı olan gözəl Şuşa şəhərinin yaradılmasının 260 illiyinə həsr edilir.

16.T.Bağırova,F.Hidayətova."Aşıq sənətinin yaranma tarixi və inkişafı". B., "Elm və təhsil", 2009, 232 səh.

Təqdim olunmuş "Aşıq sənətinin yarama tarixi və inkişafı "adlı dərs vəsaiti aşıq sənətinin genezisi,yaranma tarixi,əsrlər boyu dolğunluğu və bizim dövrə gəlib-çatan nümunələrdən ibarət işdir.

17.Zəlimxan Yaqub."Özün basdırdığın ağaca söykən".İki cilddə.I cild. B., "Şərq-Qərb", 2010, 284 səh.

60 illik yubileyi ərəfəsində işıq üzü görən ikicildliyə Xalq şairi Zəlimxan Yaqubun xalqımıza məxsus mənəvi dəyərləri,folklor yaradıcılığı qaynaqlarından süzülüb gələn ənənələri qoruyub saxlayan,ədəbiyyatımızda irsilik ideyasını tərənnüm edən şeirlərindən seçmələr və dörd poeması daxil edilmişdir.

18.Əzizxan Tanrıverdi."Azərbaycan dilinin tarixi qrammatikası". B., "Elm və təhsil", 2012.II nəşr, 464 səh.

Kitabda Azərbaycan dilinin inkişaf tarixi sistemli şəkildə izah olunmuş,tarixi fonetika və qrammatika,eləcə də leksikologiya məsələləri təkcə Azərbaycan yazılı abidələri yox,həm də Orxon-Yenisey abidələri,M.Kaşğarinin"Divani lüğət-it-türk"əsəri kimi qədim türk mənbələri müstəvisində nəzərdən keçirilmiş,oxşar və fərqli cəhətlər dəqiqləşdirilmişdir.

19.Oqtay Rza."İyirminci kitabım".(müxtəlif illərin nümunələri). B., "İrfan", 2012, 252 səh.

Altı bölmədən ibarət olan topluya müxtəlif illərdə qələmə alınan şeirlərindən nümunələr daxil edilmişdir.

20.Elman Quliyev,Aytən Abbasova,Vüsalə Zeynalova,Leyla Kərimova,Könül Sadıqova."Türk xalqları ədəbiyyatının yaradıcılıq problemləri"(dərs vəsaiti). B., 2010, 142 səh.

ADPU-nun "Türk araşdırmaları"elmi-tədqiqat mərkəzi əməkdaşlarının hazırladıqları kitabda Türk xalqları ədəbiyyatının yaradıcılıq problemləri daxilində bu ədəbiyyatın ayrı-ayrı görkəmli sənətkarlarının həyat və yaradıcılıqları tədqiqat obyekti kimi seçilmişdir.

21.Tacir Qurbanov."Ağbaba Aşıq mühiti". B., "Elm və təhsil", 2014, 196 səh.

22.Aynur İbrahimova."Azərbaycan Koroğluşünaslığı":tarixi və inkişaf mərhələləri.B., "Nurlan", 2014, 156 səh.

23.Valeh Orucov."Ümumi,neft və neft-mədən geologiyası". B., "Şəms" nəşriyyatı, 2014, 520 səh.

Kitabda ümumi geologiya,neft və qaz geologiyası,neft və qaz yataqlarının geologiyası,çöl geologiyasına dair əsas məlumatlar işıqlandırılmışdır.

24.Ziyadxan Nəbibəyli."Əxlaqa aparan yol". B., "Adiloğlu"nəşriyyatı, 2013, 356 səh.

Kitab elmi əsər olmaqla Qurani-Kərimin Məhəmməd Peyğəmbərə 23 il ərzində Allah-Taala tərəfindən vəhy olunmasına əsaslanır.

25.Lalə Dadaşova."İki və üçsəsli musiqi imlaları"(Azərbaycan bəstəkarlarının əsərləri,Azərbaycan xalq musiqisi və dünya musiqi ədəbiyyatından nümunələr əsasında dərs vəsaiti).B., "Elm və təhsil", 2014, 112 səh.

Solfecio kursu üzrə hazırkı dərs vəsaitində Azərbaycan bəstəkarlarının əsərlərindən,milli folklorumuz və dünya musiqi ədəbiyyatından iki və üçsəsli imla nümunələri təqdim olunur.

26.Üzeyir Hacıbəyli."Koroğlu".I cild 5 pərdəli opera.Partitura.I pərdə. B., "Şərq-Qərb", 2010, 280 səh.

27.Üzeyir Hacıbəyli."Koroğlu".II cild 5 pərdəli opera.Partitura.II pərdə. B., "Şərq-Qərb", 2010, 248 səh.

28.Üzeyir Hacıbəyli."Koroğlu".III cild 5 pərdəli opera.Partitura.III pərdə. B., "Şərq-Qərb", 2010, 240 səh.

29.Üzeyir Hacıbəyli."Koroğlu".V cild 5 pərdəli opera.Partitura.V pərdə. B., "Şərq-Qərb", 2010, 176 səh.

30.Üzeyir Hacıbəyli."Leyli və Məcnun".5 pərdəli,6 şəkilli opera.Partitura. B., "Şərq-Qərb", 2010, 376 səh.

31.Bəkir Nəbiyev."Üzeyir Hacıbəylinin ömürnaməsi"(Fraqmentlər). B., "Şərq-Qərb", 2010, 520 səh.

Akademik Bəkir Nəbiyevin"Üzeyir Hacıbəylinin ömürnaməsi"kitabı dahi bəstəkar, böyük mütəfəkkir və ictimai xadim Üzeyir Hacıbəylinin həyat və yaradıcılığını işıqlandıran "Üzeyirşünaslıq"silsiləsindən olan ilk kitabdır.

32.Muxammed Asad Bek."Dvenadüatğ tayn na Kavkaze".Baku,İzdatelğskiy dom "Kavkaz", 2013, 304 str.

33.Kurban "Said.Devuşka iz zolotoqo roqa".Baku,İzdatelğskiy dom "Kavkaz", 2013, 288 str.

34.Kurban Said."Ali i Nino".İzdanie vtoroe,ispravlennoe.Baku,İzdatelğskiy dom"Kavkaz", 2013, 272 str.

35.Ş.S.Fətullayev-Fiqarov."Bakının memarlıq ensiklopediyası". B., "Şərq-Qərb", 2013, 528 səh.

Kitabda Bakının qədim tarixi hissəsi olan İçərişəhər,əsas memarlıq kompleksləri, Şirvanşahlar Sarayı Kompleksi,şəhərin planlaşdırma strukturunun xüsusiyyətini müəyyən edən magistrallar,küçələr,yaşayış, mülki və dini memarlıq abidələrindən bəhs edilir.

36.Şamil Fətullayev-Fiqarov."Bakı memarları XIX əsrin sonu-XX əsrin əvvəlində". B., "Şərq-Qərb", 2013, 296 səh.

37.F.Q.Məmmədov."Orta əsrlər Azərbaycan memarlıq məktəblərinin əlaqələri". B., "Şərq-Qərb", 2013, 196 səh.

38.Nizami Nağıyev,Fikrət Hüseynov."Azərbaycan Respublikasının müasir dövr memarlıq tarixi",V cild. B., "Şərq-Qərb", 2013, 344 səh.

39.Ramiz Əbdülrəhimov,Nərgiz Abdullayeva."Erkən kapitalizm dövrünün memarlığı" (XIX-XX əsrin əvvəlləri), IV cild. B., "Şərq-Qərb", 2013, 352 səh.

40.Rayihə Əmənzadə."Azərbaycan memarlığı XV-XIX əsrin əvvəllərində", III cild. B., "Şərq-Qərb", 2013, 232 səh.

41.Ş.Fətullayev-Fiqarov."Azərbaycan memarlığının klassikləri".Mühəndis-polkovnik N.A.Fon der Nonne.B.,"Şərq-Qərb",2013,56 səh.

42.Ş.Fətullayev-Fiqarov."Azərbaycan memarlığının klassikləri".Mülki mühəndis Zivər bəy Əhmədbəyov. B., "Şərq-Qərb", 2013, 40 səh.

43.İramin İsayev."Pedaqoji irsimizdən":Molla Vəli Vidadidən Hacı Kərim Sanılıyadək". Pedaqoji-metodik ədəbiyyat. B., 2014, 406 səh.

Kitabda Azərbaycan pedaqoji fikir tarixində önəmli yeri olan M.V.Vidadinin,M.P. Vaqifin,Q.Zakirin,A.Səhhətin,H.K.Sanılının ədəbi-bədii əsərlərinin pedaqoji siqləti, gənc nəslin mənəvi-əxlaqi tərbiyəsində önəm daşıyan istiqamətləri aşkarlanmışdır.

44.M.C.Əliyev,F.A.Həsənli."Meliorativ coğrafiya". B., "Elm", 2010, 116 səh.

45.Məmmədova Kəmalə Abidin qızı."Dekorativ bağçılıq və gülçülük" (Dərslik). B., 2014, ADPU-nun nəşriyyatı, 350 səh.

Dekorativ bağçılıq və gülçülük kitabında şəhər və rayonlarda yaşıllaşdırma işlərinin aparılması qaydalarından bəhs edilir.

46.F.Q.Mamedov."Arxitekturnıe svəzi şkol zodçestva srednevekovoqo Azerbaydjana".Baku,İzdatelğskiy dom «Şarq-Qarb», 2013, 196 str.

**Nüşabə Əmirəliyeva,**
**Elmi kitabxananın Məlumat-biblioqrafiya şöbəsinin müdiri**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Tədris işləri üzrə prorektor, professor Məlikməmməd Cəbrayılova anası

**Sabiyə xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Tarix fakültəsinin dekanı, professor Oqtay Sultanova qardaşı

**Müzəffər Sultanovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Funksiyalar nəzəriyyəsi kafedrasının dosenti

**İbrahimxəlil Xəlilovun**

vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Rəsm və heykəltaraşlıq və boyakarlıq kafedrasının baş müəllimi İlqar Məmmədova anası

**Safurə xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyaziyyat və informatika fakültəsinin tyutoru Gülnarə Əliyevaya atası

**Hüseyn Əliyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 229
Sayı: 1500
Çapa imzalanıb: 30.12.2014-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.